## Giriş

Azərbaycan dili lüğət tərkibinin zənginliyi və al-əlvanlığı ilə seçilən bir dildir. Hər bir dilin mövcudluğu və inkişafı dilin təzahür formaları olan ədəbi dil, dialekt və şivələr, eyni zamanda, xalq danışıq dili ilə birbaşa bağlıdır.

Ümumxalq danışıq dilinin lüğət tərkibi isə ədəbi dilin alt qatını, bazasını təşkil edən əsas qaynaqlardan biridir. Bu zəngin xəzinənin böyük bir hissəsini zaman-zaman ədəbi dilin lüğət tərkibinə də keçən dialektizmlər təşkil edir. “Ədəbi dil şivələrdə işlənən lazımlı, həyati əhəmiyyəti olan sözləri seçib öz lüğət tərkibinə daxil edir və onu zənginləşdirir” (Cəfərov, 2007, s. 71).

Dilin tarixi inkişaf prosesi ərzində keçirdiyi deformasiyalar, sözlərdəki səs dəyişmələri, leksik bazanın genişlənib daralması, müəyyən sözlərin işlənmə məqam və situasiyaları müasir dillərdə dialekt sözləri və xalq danışıq dili əsasında müəyyən edilir. Belə sözlər bədii dilə xalqın yaddaşını gözəl bilən şair və yazıçılar tərəfindən gətirilir. Mövlud Süleymanlı da məhz belə yazıçılarımızdan biridir. Onun qələmə aldığı “Köç” əsəri Azərbaycan dilinin zənginliyini mükəmməl şəkildə əks etdirən yazılı ədəbiyyat nümunəsidir.

“Məhdud bir ərazidə yaşayan əhalinin canlı danışıq malı olan dialektizmlər yazılı ədəbiyyata bədii yaradıcılıq vasitəsilə keçir və burada üslubi vəzifə daşıyır” (Əfəndiyeva, 2011, s. 206). “Dialekt sözlər bədii əsərlərdə yerli xüsusiyyət koloritini daha qabarıq vermək, surətlərin fərdi dil xüsusiyyətlərini nümayiş etdirmək məqsədilə sənətkarın bilərəkdən istifadə etdiyi müəyyən əraziyə məxsus dil vahidləridir” (Əkbərov, 2016, s. 181). Bədii dilə gətirilən belə dialektizmlər keçmişin ən qədim və bənzərsiz əlamətlərini özündə qoruyub saxlayan dil faktlarıdır. “Realist nəsrin dil anlayışında bu (dialektizm – **red.**) yazıçının xalq dilində həssas münasibətini, dil bilgisinin genişliyini göstərən əlamət sayılır. Belə sözlər uğurlu şəkildə yazı dilində, xüsusilə nəsr dilində işləndikdə tez bir zamanda ədəbi dildə vətəndaşlıq hüququ qazanır” (Əliyev, 2008, s. 237). Müasir dillərin tədqiqi, eyni zamanda, şair və yazarların ədəbi dili öyrənilərkən dialektizmlərin tədqiqata cəlb olunması da mühüm hesab edilir.

“Məhdud ərazidə yaşayan insanların məişətində elə əşyalar olur ki, ümumxalq dilində onların adlarının qarşılığı olmur. Həmin məhdud ərazidən bəhs edən elmi və ya bədii əsərdə bu cür əşya və hadisələrin təsvirinə də yer vermək lazım gəlir” (Mustafayeva, 2010, s. 109). Belə dialekt sözləri etnoqrafik dialektizmlər adlanır. “Tarixi keçmişin təsvirində yazıçının sözdən istifadə ustalığı, arxaik və məhəlli sözləri, etnoqrafik dialektizmləri romanın dilində işlətmə bacarığı da xüsusi nəzərə çarpır” (Kazımov, 2009, s. 191). Xalqımızın dialekt xəzinəsindən seçilmiş nümunələri məharətlə öz ədəbi dilində istifadə edən Mövlud Süleymanlı yaradıcılığında da ***gəz, xalxal, teləmək*** kimi sözləri etnoqrafik dialektizm nümunələri hesab etmək olar.

“Bədii əsərin dilində işlənmiş dialektizmlərin oxucu üçün anlaşıqlı olması yazıçının sənətkarlığından çox asılıdır” (Əzizov, 2005, s. 8). “Bədii əsərlərdə işlənən dialektizmlərdən müəyyən ölçü daxilində istifadə etmək lazımdır” (Ağakişiyeva, 2021, s. 283). Mövlud Süleymanlının “Köç” əsərində işlənən hər bir dialekt söz sanki məxsusi olaraq seçilib, məhz həmin situasiya üçün yerində istifadə edilib. “Dialektizmlər leksik-semantik və üslubi funksiyasında fəallığı ilə diqqət çəkir, onlar digər nitq layları ilə çulğaşaraq fəal leksik-üslubi kateqoriya vəziyyətinə keçir” (Həsənova, 2022, s. 6). Müəllifin ədəbi dilində işlənən dialektizm nümunələrini semantik çalarlarına görə üç əsas qrupa bölmək mümkündür: 1) Əlamət bildirən dialektizmlər; 2) Ad – əşya, məkan, varlıq və s. bildirən dialektizmlər; 3) Hərəkət bildirən dialektizmlər (bax: İbrahimova, 2023).

## Tədqiqat

### 1. Əlamət bildirən dialektizmlər

**Arıqanaq.** Bu sözə yalnız Mövlud Süleymanlı yaradıcılığında rast gəlmək mümkündür: *Balaca, **arıqanaq** üzü göyə çalırdı* (Süleymanlı, 2004, s. 22). “Arıq, ordları batmış, cansız” deməkdir. Ehtimal ki, Qərb şivələri qrupuna aid olan “arıqanaq” sözü Kübra Quliyevanın “Bədii ədəbiyyatda dialektizmlər” adlı lüğətində elə Mövlud Süleymanlı yaradıcılığına xas dialektizm nümunəsi kimi təqdim edilmişdir.

**Boşarqı.** Bu söz Qərbi Azərbaycanın Amasiya rayonu ərazisinə, Ağbaba şivəsinə aiddir. ***Boşarqı*** *bağladığı ağ kəlağayısından açıq yaxası görünürdü* (Süleymanlı, 2004, s. 19). "Boşarqı" dayanıqsız, hər hansı bir şeyin boş bağlanması (Bayramov, Bayramova, 2014, s. 46) deməkdir.

**İfçin**. *Kəhər atlar* ***ifçin*** *çullandı, oğlanlar qıpçaq geyindilər, ovçular oxlandı, kəməndçilər örkələndi* (Süleymanlı, 2004, s.61). "İfçin" Zaqatala şivəsində möhkəm və yaxşı mənasını bildirir.

**İmirçə**. *Bəkil bir neçə ilin içində içi qaynaya-qaynaya böyüyüb* ***imirçə*** *igid oldu* (Süleymanlı, 2004, s. 41). "İmirçə" sözünə Azərbaycan dili lüğətlərində rast gəlinmir. Ehtimal ki bu söz yazarın ya Qərb şivələrində eşitdiyi, ya da özünün yaratdığı sözlərdən biridir. Sözün kökündə dayanan "imir" adı isə Azərbaycan dilinin izahlı lüğətində "şah arı" kimi verilib (Azərbaycan dilinin izahlı lüğəti, 2007, IV cild, s. 538). Təsadüfi deyil ki, yazar "imir" sözündən roman boyunca onomastik vahid – şəxs adı kimi istifadə etmişdir.

**Genəşik.** *Qarakəllələrin* ***genəşik*** *yeri olmuşdu* (Süleymanlı, 2004, s.78). Bu dialektizm nümunəsinə lüğətlərdə rast gəlinmir. Lakin Tovuz şivəsində məsləhətli anlamında [geŋəşix`li] sözünün işlək olduğu məlumdur. Yazarın istifadə etdiyi sözün qısa şəkli də eyni məna bildirir.

**Koruş**. "Koruş" sözü Bolnisi, Qazax və Tərtər şivələrində "küt, kəsməyən" anlamlarını daşıyır: *Hələ qabaqda* ***koruş*** *qılınclara, pas atan oxlara, kişnəyən atlara baxıb fikrə getmək varıdı* (Süleymanlı, 2004, s. 63).

**Ad – əşya, məkan, varlıq və s. bildirən dialektizmlər**

**Arxac**. "Arxac" və ya "arxaj" Başkeçid və Borçalı şivələrində ilin isti fəsillərində sürü və naxırların açıq havada yaratdığı müəyyən yerdir. *Bu dolama cığırları, bu göycə dağları, bərələri,* ***arxac*** *yerlərini harda görmüşdü, anlaya bilmirdi… İlxılarınız hürkəcək hələ, sürüləriniz* ***arxacdan*** *qopacaq, itləriniz hələ təzə yurda hürəcək* (Süleymanlı, 2004, s. 73).

**Bələn.** "Bələn" sözünün Azərbaycan dili dialektlərində üç mənası vardır: 1) Gəncə, Qarakilsə, Qazax, Şəmkir və Tovuz şivələrində dağ aşırımı; 2) Qazaxda pusqu yeri; 3) Borçalı və Cəbrayılda hündür yer və təpə. ***Bələn****dən bir dəstə atlı çıxdı* (Süleymanlı, 2004, s. 176).

**Çapoolçu**. *Köçümüzə* ***çapoolçu*** *gəldi. Çapdılar, taladılar...* (Süleymanlı, 2004, s. 57) [Çapo:ulçu] Laçın şivəsində qarətçi, çapqınçı anlamını daşıyır.

**Çeyillik**. "Çeyillik" sözü lüğətlərdə çoxlu çeyil bitən yer kimi izah edilir. Çeyil isə bataqlıqlarda bitən bir ot növüdür. Bəzi dialektlərdə bataqlıq ərazi də çeyil adlandırılır. *Göy ağızlı itləri yiyəsizləyib* ***çeyillik*** *kimi çürüməyə başladı* (Süleymanlı, 2004, s. 154). Bu nümunədə də itlərin çeyillik kimi çürüməsi bir zamanlar canlı olan ərazinin çürüyüb bataqlıqlaşması ilə bənzərlik təşkil edir.

**Çəhlim**. *Qurdlar arxaclarına* ***çəhlim*** *saldı* (Süleymanlı, 2004, s.154). "Çəhlim" sözü Qərb qrupu şivələrində yol, cığır, iz və ləpir anlamlarını ifadə edir.

**Çumbuz.** Başkeçid, Borçalı, Qazax və Şəmkir şivələrinə xas sözdür. *Damların üstünə döşənmiş* ***çumbuzlar*** *göyərib yamyaşıl olmuşdu* (Süleymanlı, 2004, s. 20). "Çumbuz" və ya "çumpuz" çim, kökləri bir-birinə qarışmış ot bitkiləridir.

**Gap-gələcə.** Bu sözə Mövlud Süleymanlı ədəbi dilində rast gəlmək mümkündür. Onun hekayələrinin leksikasında da "gap-gələcə" sözü ilə bir neçə dəfə qarşılaşırıq. *Qarılar, arvadlar pıçıldşa-pıçıldaşa gəlini alaçığa apardılar, qızları alaçıqdan çıxartdılar, kişilər* ***gap-gələcə*** *eliyə-eliyə daşların başında oturmuşdular* (Süleymanlı, 2004, s.74). Lüğətlərdə belə bir sözün izahına rast gəlinmir. Lakin mürəkkəb sözün birinci hissəsinin Qarabağ şivələrində söhbət anlamını daşıdığını görmək mümkündür. "Gap-gələcə" də "oradan-buradan söhbət etmək" kimi anlaşıla bilər.

**Gəz.** *Qamış kəsib, qamışa doldurub ağzını müşəmbələdi, mumladı, gətirib dirəyin* ***gəz****inə qoydu* (Süleymanlı, 2004, s. 161). "Gəz" sözü də dialektlərdə işlək sözlərdən biridir. Bir neçə mənası var. Ağacdan çəpərlərin tapdanmış, iz düşmüş yeri, aşırım və hanada oxların yan ağaclarına keçdiyi yeri bildirir. Dirəyin gəzi də, ehtimal ki, dirəkdə nəsə dayamaq üçün əzilmiş və ya oyulmuş yeri bildirir.

**Gözək.** Ağdaş şivəsində iynə mənasını bildirən "gözək" sözü Cəbrayıl, Qax, Salyan və Yevlax şivələrində çuvalın ağzında olan ilmək, çuvalın ağzını büzmək üçün istifadə edilən ip anlamını daşıyır. *Köçdən yüklər boşaldı, farmaşların* ***gözəyi*** *açıldı* (Süleymanlı, 2004, s. 70).

**Xalxal.** Qərb şivələrinin çoxunda "xalxal" sözü açıq hava şəraitində mal-qara saxlamaq üçün ətrafı hasarlanmış yeri bildirir. *İki təpənin arsına çıxdılar. Köhnə yurd yerləri vardı, daş* ***xalxallar***

*vardı* (Süleymanlı, 2004, s. 70). Burada da köhnə yurd yerlərinin yanında heyvan saxlamaq üçün ətrafı daşlarla əhatələnmiş ərazi anlamında işlənib.

**Kalafalıq.** *O görünən dağın dibində saraylar tikilib, indi **kalafalıqları** qalıb* (Süleymanlı, 2004, s.63). Şivələrdə “kalafa” sözünün quyu, ev və ya tövlə tikmək məqsədilə qazılmış yer, çuxur ərazi kimi mənaları olsa da, bu nümunədə Bakı və Böyük Qarakilsə şivələrindəki kimi xaraba, uçub dağılmış yer anlamlarını bildirir.

**Kalça.** “Kalça” şivələrimizdə camışın bir yaşa qədər olan erkək balası mənasını bildirir. *Bu **kalça**nın səsinə bax, aaz, – dedi, güldü...* (Süleymanlı, 2004, s. 162) Nümunədə isə uşağın cır səsi ev heyvanının balasının səsinə bənzədilir.

**Kərən.** Qərb qrupu şivələrində “kərən” evin üstünə sır iləqoyulan tir anlamını bildirir. *Bəkil gözlərini **kərən**ə zilləmişdi* (Süleymanlı, 2004, s. 169).

**Qarğın**. Qərbi Azırbaycanın Ağbaba şivəsində “qarğın” sözü qar suyunun yığıldığı yerdir. *Bir gün buludlar qarın-qarına dəydi, göylərin gözü yumuldu, çatı yoğunnuğunda yağış yağdı, sel qopdu, **qarğın** oynadı, dərələr düz oldu, düzənlər dərə oldu, ilxı bağrı çatdadan, it ürəyi dağıdan, sürüləri bölük-bölük, naxırları pərən-pərən eliyən rüzgar əsdi* (Süleymanlı, 2004, s. 53).

**Qomarğa.** Gədəbəy və Qazax şivələrində “qomarğa” mühasirə mənasında işlənir. *O biri atlıların **qomarğa**sına düşmüş yoldaşını səslədi* (Süleymanlı, 2004, s. 75).

**Öpkə**. “Öpkə” dialektlərdə ağciyər orqanı və ya ağciyər xəstəliyini bildirir. *Uzun-uzadı yollara alışmış sürüləri yatmaqdan xəpənəg olub **“öpkə”** ağrısı tapmışdı* (Süleymanlı, 2004, s.100). Nümunədə də öpkə ağrısı dedikdə ağciyər ağrısı nəzərdə tutulur.

**Örənə.** “Örənə” sözü Şəki və Zaqatala şivələrində xaraba, viranə qalmış ərazi mənalarını bildirir. *Bura mal-qoyunun **örənə**si idi* (Süleymanlı, 2004, s. 22); *Sürülər, naxırlar da çöllərdən, örənələrdən yığılıb axşamla bir yerdə kəndə töküldü* (Süleymanlı, 2004, s. 171). Qazax şivəsində isə otu biçilmiş otlaq anlamına gələn bu söz, fikrimizcə, Mövlud Süleymanlı ədəbi dilində məhz bu mənada işlənmişdir.

**Öynə.** ***Öynədə** otuz yumurta yeyərdi, bir sərnic **atlama** içərdi* (Süleymanlı, 2004, s. 28). Bu nümunədə iki dialektizm işlənmişdir. *Yeddi **öynə** yanımda qalacaqsan* (Süleymanlı, 2004, s. 115). Zəngilan, Beyləqan, Borçalı, Cəbrayıl, Göyçay, Hamamlı, Qazax, Şərur şivələrində dəfə, kərə mənalarına gələn “öynə” sözü Borçalı, Gədəbəy, Gəncə, Qazax, Lənkəran, Oğuz, Salyan, Tovuz, Ucar, Zərdab şivələrində günorta yeməyi anlamını bildirir (bax: Azərbaycan dilinin dialektoloji lüğəti, 2007, s. 390). Kəlbəcər, Qazax, Qəbələ şivələrində “atlama”, Gədəbəy və Şəki şivələrində isə “atılama” su ilə qatığın qarışığından hazılanmış sərinlədici içkidir.

**Patava.** Zaqatala şivəsində iş əlcəyi, Salyan şivəsində isə uzunboğaz çəkmə anlamını bildirən bu sözün Mövlud Süleymanlı dilində hansı mənada işləndiyini demək çətindir: *Uğur qamçını **patava**sına çəkdi* (Süleymanlı, 2004, s. 138). Nümunədən aydın olur ki, “patava” sözü geyimin bir parçasıdır. Hər iki məna situasiyaya uyğun görünür.

**Suç**. Dilimizin qədim sözlərindən olan “suç” sözü Cəbrayıl, Çənbərək, Gədəbəy, Qax, Tovuz, Zaqatala şivələrində “təqsir, günah” mənalarını bildirir: *Ey yeri-göyü yaradan, günahkar bəndənəm, ululların ulusu, sən böyüksən, yer üzünün **suç**u böyüyür, keç günahlarımızdan, şeytan şərinnən, bəy əmlinnən qoru bizi.*

**Şax**. *Oğlan evi oğlan **şaxı** bəzədi, qız evi qız **şaxı** bəzədi* (Süleymanlı, 2004, s.61). Borçalı, Daşkəsən və Tərtər şivələrində “şax” toy mərasimləri zamanı təzəbəy və ya gəlin üçün yaxın dostları tərəfindən hədiyyə olaraq gətirilən, üzəri şirniyyat və meyvlərlə bəzədilmiş budaq parçasıdır. Bu adət günümüzdə də bölgələrimizdə qorunub saxlanılır.

**Tənə**. Bu söz Şəmkir və Şuşa şivələrində qulağın yumşq hissəsi və ya sırğa anlamlarında işlənir. *İzn ver, düşək, qoxuçiçəyi yığaq, Dədə. Qulağımızın **tənəsi** qoxulanmır* (Süleymanlı, 2004, s.51).

**Uruf.** ***Uruf** yolu darmadağın, ağ Bəyim!* (Süleymanlı, 2004, s.171) Bu sözün bir neçə mənası var. Nümunəyə uyğun olanı Xanlar şivəsində işlənən hörmət, təmtəraq anlamıdır. Romanda Qanıq nəsli ilə Qarakəllə nəsli arasında qan davası var. Lakin buna baxmayaraq, Qanıq qızlarını Qarakəllə ocağına çəkib gəlin gətirən qəribə bir qüvvə var. Sanki “bir-birinizdən qız alıb verin, qan davası bitsin” deyən bir səs ucalır. Qanıq qızlarına Qarakəllə oğulları buta verilir. Lakin Qanıq nəsli sevənləri ayırmaq üçün hər şey edir və nəticədə Qanıq qızlarının adı eldə-obada dilə-dişə düşür.

Nümunədə də Bəyimin anası Qızbəsin dilindən nalə eşidirik. Keçmişin yaddaşına vaqif olan Bəyimin sevdiyi Bəkilin kiçik qardaşı İmir öncədən gördüyü bir hadisəni, sevənlərin birlikdə olduğu anı özü də bilmədən kənd uşaqları ilə oyun oynayarkən dilinə gətirir. Beləcə, Bəkil və Bəyimin sevdası Qanıq uşaqlarının dilinə düşür. Qızının gələcəyindən narahat olan, yeni bir qan davasının cücərib boy atmasından qorxan ana hörmət, ehtiram yolunun artıq qapandığını kədərli şəkildə dilə gətirir.

**2. Hərəkət bildirən dialektizmlər**

**Bükdərilmək.** *Yer üzü həmin alabəzək rəngə qarışa-qarışa, **bükdərilə-bükdərilə** fırlanmağa başladı* (Süleymanlı, 2004, s.168). "Bükdərilmək" ikiqat bükülmək, bükülmüş bir şeyi yenidən bükmək anlamını ifadə edir (Azərbaycan dilinin izahlı lüğəti, I cild, 2007, s. 369).

**Cənsimək.** "Cənsimək" feili Qazax şivəsində itlərin astdan hürməsinib bildirir. *Qurtan ağanın adamları içindən-içindən uğuldayırdı, atları fınxırıb ağır ayaqlarını yerə döyürdülər, itləri **cənsiyə-cənsiyə** özlərini alaçıqlara vururdular* (Süleymanlı, 2004, s. 142). Bu nümunədə isə yazar söz təkrarı ilə mənanı qüvvətləndirmişdir.

**Çığnamaq.** Qərb və Şimal-Qərb şivələrində "çığnamaq" ayaqlamaq, tapdalamaq mənalarını ifadə edir. *Kinindən boğulan Ağ dəvə bu doğma üzü tanıya bilmədi, Apanı ayaqları altına alıb **çığnadı*** (Süleymanlı, 2004, s.77).

**Çöysümək.** *Yalnız Bəkilin sürüsü hürkən ilxıları, perikən quşların, çaşan adamların arasında yer üzünün ən böyük dincliyi kimi Axçalının döşünə sərələnib, **çöysüyüb** otlayırdı* (Süleymanlı, 2004, s.26). Qərbi Azərbaycanın Çəbərək şivəsinə aid olan [çöysüməx`] sözü daraşmaq anlamını bildirir (Azərbaycan dilinin dialektoloji lüğəti, 2007, s. 107).

**Oxranmaq.** [Oxrammax`] Ağdam, Ağdərə, Başkeçid, Borçalı, Gədəbəy, Qazax şivələrində atın astadan kişnəmməsi deməkdir. Cəbrayıl və Çənbərək şivələrində isə ağlamaq anlamını daşıyır. *Kəhər at... Sonra içindən-içindən **oxrandı*** (Süleymanlı, 2004, s. 44). Yazar bu nümunədə atın kişnəməsini ağlamaq, səssiz nalə çəkməyə bənzətmişdir.

**Senmək.** [Senməx`] Tərtər, [Senmax`] Balakən şivələrində sakitləşmək, yavaşımaqdır. *Bəkilin səsi **senmişdi**, amma yeri-göyü uğultu bürümüşdü* (Süleymanlı, 2004, s. 48).

**Sinirmək.** "Sinirmək" feili dialektlərdə həzm etmək, dözmək, qəbul etmək anlamlarında işlənir. *Yamacları **sinirə-sinirə**, kövşəyə-kövşəyə yatışdılar* (Süleymanlı, 2004, s.104). Nümunədə axşam çağı qoyunların düzdən-düzənlikdən obaya qayıtması təsvir edilərkən bu söz işlənmişdir.

**Teləmək.** *Axşam yetim quzuları doğar qoyunlara **teliyəcəm*** (Süleymanlı, 2004, s.107). "Teləmək" feili Kəlbəcər şivəsində isinişdirmək, alışdırmaq mənalarını bildirir. Belə ki, heyvanın yeni doğulmuş balası öldükdə anası ölmüş başqa bir balanı ona alışdırmaq üçün "teləmək" feilindən istifadə edilir. Bunu hər çoban edə bilmir. Xüsusi istedad tələb edən bu prosesi həyata keçirən şəxsə də teləçi deyilir.

## Nəticə

Yekun olaraq qeyd edə bilərik ki, Mövlud Süleymanlı "Köç" romanında Azərbaycan dilinin zəngin xəzinəsindən seçdiyi dialektizmləri həm obrazların dilində, həm də müəllif təhkiyəsində məharətlə istifadə etmişdir. M.Süleymanlı daha çox Qərb şivələrində işlək olan sözləri öz ədəbi dilinə gətirmişdir. "Köç" 165 səhifəlik romandır. Hətta onu bir xalqın dastanı da adlandıra bilərik. Lakin bu 165 səhifədə cəmi 38 dialekt sözü oxucunu yormadan, uyğun məqam və situasiyalarda işlənib. Romanda işlənən dialektizmləri ifadə etdiyi məna çalarlrına görə üç cür qruplaşdırmaq mümkündür: 1. Əlamət bildirən; 2. Əşya, məkan, varlıq və s. ifadə edən; 3. Hərəkət bildirən dialektizmlər. Bu nümunələrdən altısı birinci, iyirmi beşi ikinci, yeddisi isə üçüncü qrupa aiddir.

## Ədəbiyyat

1. Ağakişiyeva, G. (2021). Azərbaycan dilçiliyi və ədəbiyyatşünaslığında dialektizmlərin tədqiqi məsələləri. *Filologiya və Sənətşünaslıq*, (2), 281–290.
2. Azərbaycan dilinin dialektoloji lüğəti. (2007). Şərq-Qərb.
3. Azərbaycan dilinin izahlı lüğəti: I cild. (2007). Şərq-Qərb.
4. Azərbaycan dilinin izahlı lüğəti: IV cild. (2007). Şərq-Qərb.

5. Azərbaycan ədəbi dili tarixi. (2007). Şərq-Qərb.
6. Bayramov, A., & Bayramova, A. (2014). *Ağbaba şivəsi sözlüyü*. AM965.
7. Cəfərov, S. (2007). *Müasir Azərbaycan dili. II hissə: Leksika*. Şərq-Qərb.
8. Əfəndiyeva, T. (2011). *Azərbaycan dilinin leksik üslubiyyatı*. Elm və Təhsil.
9. Əkbərov, Ə. (2016). *Müasir Azərbaycan dilinin üslubiyyatı*. ADPU.
10. Əliyev, R. (2008). *Ədəbiyyat nəzəriyyəsi*. Mütərcim.
11. Əzizov, E. (2005). Dialektizm anlayışı və bəzi dialektizmlər haqqında. *Bakı Universitetinin xəbərləri. Humanitar elmlər seriyası*, (2), 5–10.
12. Həsənova, K. (2022). *Layla və oxşamaların dili* (Fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı). Sumqayıt Dövlət Universiteti.
13. İbrahimova, Ü. (2023). Mövlud Süleymanlının hekayələrində dialektizmlər. *Elmi İş*, *17*(9), 28–32. https://doi.org/10.36719/2663-4619/94/28-32
14. Kazımov, Q. (2009). *Seçilmiş əsərləri* (4-cü cild). Nurlan.
15. Mustafayeva, Q. (2010). *Azərbaycan dilinin üslubiyyatı*. Elm.
16. Süleymanlı, M. (2004). *Üç roman: Köç, Ceviz qurdu, Səs*. Azərbaycan nəşriyyatı.

Daxil oldu: 03.01.2025
Qəbul edildi: 08.04.2025

DOI: https://doi.org/10.36719/2706-6185/47/86-90

**Ruslan Məmmədov**
İstanbul Marmara Universiteti
doktorant
https://orcid.org/0000-0003-4136-0902
ruslanmuderris@gmail.com
**Ali Tülü**
İstanbul Maramara Universiteti
https://orcid.org/0000-0002-3245-2744
ali.tulu@marmara.edu.tr

# İliyya Əbu Mazinin Mənzum Hekayələrində Məcaz və Kinayələr

## Xülasə

Ərəb Məhcər şairi Əbu Mazi müasir Ərəb ədəbiyyatının ən çox tədqiq edilən şəxslərindən biridir. O, uzun müddət ABŞ-da mühacirət həyatı yaşayarkən, bu illər ərzində müxtəlif məzmunlu lirik şeirlər və mənzum hekayələr qələmə almışdır. İndiyə qədər ədiblər onun əsərlərini müxtəlif yönlərdən təhlil etmişlər. Biz isə bu məqaləmizdə Əbu Mazinin mənzum hekayələrində istifadə etdiyi məcaz və kinayə növləri ilə yanaşı, Ərəb bəlağət elmində məcaz və kinayə barədə qarşıya qoyulan bir sıra problemlərə toxunacağıq. Çünki məcaz və kinayə ilə əlaqədar bəzi məsələlərə aydınlıq gətirməsək, Əbu Mazinin bəlağət elmində bacarıq səviyyəsini analiz edə bilmərik.

***Açar sözlər:*** *Əbu Mazi, məcaz, kinayə, şeir, mənzum hekayələr*

**Ruslan Mammadov**
İstanbul Marmara University
PhD student
https://orcid.org/0000-0003-4136-0902
ruslanmuderris@gmail.com
**Ali Tulu**
İstanbul Marmara University
https://orcid.org/0000-0002-3245-2744
ali.tulu@marmara.edu.tr

# Allegory and Sarcasm in the Verse Stories of Iliyya Abu Mazi

## Abstract

The Arabic Mahjar poet Abu Mazi is one of the most studied figures of modern Arabic literature. While living as an emigrant in the United States for a long time, he wrote lyrical poems and verse stories of various contents during these years. So far, writers have analyzed his works from different perspectives. In this article, we will touch upon the types of metaphor and irony used by Abu Mazin in his verse stories, as well as a number of problems posed by metaphor and irony in the science of Arabic eloquence. Because if we do not clarify some issues related to metaphor and irony, we cannot analyze the skill level of Abu Mazin in the science of eloquence.

***Keywords:*** *Abu Mazi, metaphor, irony, poem, verse stories*

## Giriş

Bəlağət kitablarında istiarə mövzusu üzərində apardığımız araşdırmanın sonunda belə nəticəyə gəldik ki, müfrəd istiarə dildə leksik normaların pozulması deməkdir. Lakin bu pozulma, istiarənin hər iki tərəfi üçün müştərək olan təşbih vasitəsi ilə dəstəklənərsə, bu pozulma hadisəsi dildə qüsur sayılmaz. Müfrəd mürsəl məcaza gəlincə, onun barəsində də eyni şeyi demək olar.

 

Lakin bu növ məcazda leksik normanın pozulması təşbihin dəstəyi hesabına deyil, digər əlaqələrin dəstəyi hesabına baş verir. Bizim bu söylədiklərimiz orijinal bir fikir olsa da, onun təsdiq edilmiş aksioma çevrilməsi üçün çox geniş müzakirələrə ehtiyac yoxdur. Lakin fikrimizi əsaslandırmaq üçün aşağıdakı Quran ayəsinə və Əbu Zueyb Əl-Huzlinin şeirinə nəzər salmaqda fayda vardır.

إِذْ أَرْسَلْنَا عَلَيْهِمُ الرِّيحَ الْعَقِيمَ

﴿*Biz onların üzərində qısır külək göndərdik*”.﴾

**Tədqiqat**

Məlum olduğu kimi, qısır olmaq qadınlara məxsus bir hadisədir. Lakin küləyin qısır olması ifadəsi bizə sanki burada leksik normanın pozulması təəssüratı bağışlayır. Lakin yuxarıda da qeyd etdiyimiz kimi, bu tərzdə leksik normaların pozulması təşbih hesabına dəstəkləndiyi müddətcə belə bədii təsvir ifadələri dildə qüsur sayılmaz. Müasir Ədəbiyyat nəzəriyyəsində belə hadisələrə epitet adı verilir. Burada külək övladı olmayan qadına bənzədilmişdir. Qadın *müstəarun minhu*, külək isə *müstəarun ləhu* hesab edilir.(Əl-Xətib Əl-Qəzvini, 2014, p. 208; Əs-Subki, 2003, p. 2\62) Lakin bu məsələdə bəlağət alimləri başqa versiyalar da irəli sürmüşlər. Qəzvini qadının qısır olmasını *müstəarun minh*, küləkdəki yağmur gətirməyə mane olan əlaməti isə *müstəarun ləhu* hesab etmişdir.(Əl-Xətib Əl-Qəzvini, 2014, p. 208) Lakin Bəhaəddin Subki buna etiraz etmiş və demişdir ki, “burada عقيم kəliməsi məcazi ləfz olduğu halda, necə ola bilər ki, o, *müstəarun ləhu* hesab edilsin”.(Əs-Subki, 2003, p. 2\163) Cövhəri isə عقيم kəliməsinin külək üçün həqiqət olduğunu söyləmişdir.(Əs-Subki, 2003, p. 2\164) Bəhaəddin Subki hesab edirdi ki, Şirazi və ondan sonra gələn alimlərin “Səkkakinin məzhəbinə görə bu ayə məkni istiarə olmalıdır” demələri xətadır.(Əs-Subki, 2003, p. 1/163)

غَمْرُ الرداءِ إذا تبسم ضاحكا

*Təbəssüm edərkən (insanlara) mal paylayandır.*

Burada غمر kəliməsi paltar üçün işlənib. Bu isə dildə leksik normanın pozulması deməkdir. Çünki Ərəb dilində غمر kəliməsi paltar üçün yox, malın paylanması üçün işlənən kəlimədir. Ərəb dilində çox hədiyyə verən insan üçün də bu kəlimə istifadə edilir.(Ər-Razi, 2008, p. 775) Burada الرداء kəliməsində təsrihi istiarə cərəyan etmişdir və الرداء kəliməsi ilə hədiyyə olaraq verilən mal nəzərdə tutulmuşdur. Hətta bəzi qədim ərəb lüğətlərində غمر الرداء ibarəsi yuxarıda qeyd etdiyimiz məcazi mənası ilə birlikdə qeyd edilmişdir.(Əl-Feyruzabadi, 2008, p. 1202) Biz bu şeir barədə növbəti səhifələrdə ətraflı izah vermişik.

Əbu Mazi mənzum hekayələrində **lüğəvi** məcazın həm *mürsəl*, həm də *istiarə* növündən istifadə etmişdir. O bu hekayələrdə bəzən müfrəd istiarənin həm *təsrihi*, həm də *məkni* növlərindən istifadə edirdi. Lakin onun *mürəkkəb mürsəl* məcazı qullanıb-qullanmadığına əhəmiyyət vermədik. Çünki məcazın bu növündən nəyinki şeirlərdə, hətta gündəlik nitqimizdə də istifadə edilir. Şairin hekayələrində müstəqil şəkildə, yəni müfrəd istiarəyə bağlı olmayan *əqli* məcazdan istifadə edib-etmədiyini müstəqil başlıq altında araşdırmağa çalışmadıq. Lakin nəzərə alsaq ki, cumhur alimlərə görə *məkni istiarənin* qərinəsi olan *təxyili* məcaz *əqli* məcazdan sayılır,(Əl-Haşimi, 2013, p. 279) onda qəbul etməliyik ki, Əbu Mazi *əqli* məcazdan da istifadə edib. Çünki onun mənzum hekayələrində *məkni* istiarədən istifadə edilib. Bundan əlavə, şairin bir neçə yerdə *kinayənin* müxtəlif növlərindən istifadə etdiyinə rastladıq. Bəzi bəlağət alimləri kinayəni məcazdan hesab ediblər.(Atiq, 1985, pp. 220–221) Bəhaəddin Subki və digərləri isə kinayənin həqiqət olduğunu söyləmişlər.(Əs-Subki, 2003, p. 2\127) Əlbəttə ki, buradakı “məcaz” sözü mütləq şəkildə qeyd edildiyi üçün onun ilə *lüğəvi* məcaz nəzərdə tutulur, *əqli* məcaz deyil. Çünki bəlağət elmində məcaz mütləq şəkildə zikr edildikdə onunla *lüğəvi* məcaz murad edilir.(Əl-Haşimi, 2013, p. 265)

**Əbu Mazinin İstifadə Etdiyi Mürsəl Məcazlar**

Bəlağət elmində Səkkaki, Qəzvini və Cumhur alimlərin təsis etdiyi elmi məktəblər və bu məktəblərin qəbul etdiyi nəzəriyyələr bəlağətçilərin bu elmin bütün məsələləri barədə yekdil rəydə olmadığını sübut edir. Buna görə də bəlağət elmi ilə məşğul olan insanlar bu məsələlərdən danışarkən diqqətli olmalıdırlar və hansı rəyin doğru olduğunu təyin etmək üçün tələsik qərar verməməlidirlər. İmam Buxarinin (rahmətullahi aleyh) də söylədiyi kimi “elm qövl və əməldən öncədir”.(Əl-Buxari, 2008, p. 1/70) Yəni insan ilk öncə öyrənməli, sonra bildiyini danışmalıdır. Bu elmi məktəblərə mənsub olan bəlağət alimləri bəzən bir məcazın növünü təyin edərkən müxtəlif elmi faktlara söykənərək fərqli qərarlar vermişlər. Bu o qədər də təəccüblü bir şey deyil. Çünki mümkündür ki, bir

ləfz vahid mənaya nəzərən iki etibar ilə həm mürsəl məcaz, həm də istiarə hesab edilsin.(Əl-Məraği, 2002, p. 255; Əş-Şirazi, 1422, p. 215) Məsələn, نطقت الحال ibarəsində نطق kəliməsi təşbih etibarı ilə *təbəi* olan *təsrihi* istiarədir. Lakin nitqdən dəlalət doğması etibarı ilə *mürsəl* məcazdır.(M. bin A. Əl-Qəzvini, 2010, p. 104) Biz bu başlıq altında Əbu Mazinin mənzum hekayələrindəki həm mürsəl məcazları dərindən analiz edəcəyik, həm də onların məcazın digər növlərindən ola bilməsi ehtimalını müzakirə edəcəyik.

Biz şairin "Röya" isimli mənzum hekayənin sonuncu beytində belə bir misra ilə qarşılaşırıq: أبلت نعالي ألسن السفهاء "*Mənim ayaqqabılarımı səfehlərin dilləri yırtıb*".

"Yırtmaq" feilinin icrası kəlimələr vasitəsi ilə mümkün olmadığı üçün, demək ki, burada feil özünə aid olmayan bir cümlə üzvünə isnad edilib. Bunu nəzərə alaraq, deyə bilərək ki, burada *əqli* məcazın olması mümkündür. Əgər qəbul etsək ki, burada *əqli* məcaz var, onda bizim "dillər" sözünü "kəlimələr" mənasına yoza bilmərik. Çünki *əqli* məcazda kəlimələr həqiqi mənasında işlənir, məcazilik isə isnadda olur. Bəzi bəlağət kitablarında əqli məcazdan bəhs edilərkən məcaziliyin (*təcəvvüz*) hökmdə olduğu söylənilmişdir.(Əl-Məraği, 2002, p. 291) Yəni bəzi kitablarda isnadın yerinə hökm sözü işlədilib. Bəlkə, buna görə də Abdulqahir Cürcani əqli məcazı "*əl-məcaz əl-hukmi*" adlandırmışdır.(Atiq, 1985, p. 144) Bu cümlədə əqli məcazın əlaqəsi (ملابسة) "səbəbiyyə" hesab olunmalıdır. Çünki dil ayaqqabının yırtılmasına səbəb ola bilər. Biz "dillərin ayaqqabını yırtması" ibarəsinin bəzi xüsusiyyətlərini nəzərə alıb onun *məkni* istiarə olduğunu da düşünə bilərik. Bəlkə, elə Səkkaki də bir zamanlar bizim kimi düşünüb əqli məcazı *məkni* istiarə ilə eyniləşdirmişdi. Səkkaki dildə *əqli* məcazın olduğunu inkar edirdi və o, hesab edirdi ki, *əqli* məcaz elə *məkni* istiarədir. Səkkakiyə görə, أنبت الربيع البقل cümləsində الربيع kəliməsində *məkni* istiarə cərəyan etmişdir və الربيع kəliməsi ilə həqiqi fail nəzərdə tutulmuşdur.(Əl-Məraği, 2002, p. 295) Əgər Səkkaki kimi düşünsək, onda "dillər" kəliməsində *məkni* kinayənin cərayan etdiyini və onun faildən kinayə olduğunu söyləməliyik. Sonra da düşünməliyik ki, "yırtmaq" sözü müşəbbəh bihinin spesifik xüsusiyyəti rolunda olan qərinədir. Lakin Səkkakinin bu rəyi məqbul hesab edilməmişdir. Çünki belə cümlələrdə istiarənin məzkur tərəfini faildən kinayə hesab etsək, gərək bir şeyin özü-özünə izafət edilə bilməsini qəbul edək. Bir şeyin özü-özünə izafət edilməsi isə mümkün deyil.(Əl-Məraği, 2002, p. 296) Alimlər aşağıdakı misallar ilə Səkkakiyə rədiyyə vermişlər.

فما ربحت تجارتهم "Onların ticarəti karlı olmadı".

Bu ayədə Səkkakinin iddiasına əsaslanaraq, ticarət sözünü fail (tacirlər) üçün kinayə hesab etsək, onda "tacirlər" sözü "onlar" [هم] sözünə, yəni bir şey özü-özünə izafət edilmiş olacaq. Belə bir şey isə dildə mümkün deyil.

Bir çox bəlağət kitablarında əqli məcazın tərifi verilərkən onun isnadda olduğu söylənilmək ilə kifayətlənilmişdir.(Atiq, 1985, p. 143; Avni, n.d., p. 55; *Əl-Bəlağa (1) Əl-Bəyan vəl-Bədi*, 2011, p. 144; Əl-Məraği, 2002, p. 247; Əmin, 1982, p. 78) Lakin bu məsələdə biraz təfsilata varmaq lazımdır. Əslində, *əqli* məcaz isnadda yox, nisbətdə olur. Nisbət isə üç cürə olur. 1) *isnadi nisbət*, 2) *izafi nisbət* və 3) *iqai nisbət*. (Əl-Məraği, *Ulumul-Bəlağə: Əl-Bəyan vəl-Məani vl-Bədi*, 293.) Bunu unutmamaq lazımdır ki, bəlağət elmində isnad ilə nəhv elmindəki isnad eyni şey deyildır. Bəlağət elmində isnad ilə nisbət murad edilir. Nisbətin qeyd etdiyimiz növlərini nəzərə alıb "Səfehlərin dilləri yırtdı" cümləsini diqqətlə incələdikdə görürük ki, burada *əqli* məcaz *iqai* nisbətdə cərayan edib. Çünki feil aid olduğu "səfehlər" sözünə yox, "səfehlər" sözünə aid olan dil sözünə nisbət edilib.

Bəzi bəlağət alimləri əqli məcazı tərəfləri baxımından qisimlərə ayırmışlar. Onlar hesab edirdilər ki, əqli məcazın hər iki tərəfi ya həqiqət, ya məcaz, ya da müxtəlif ola bilər. (Əl-Məraği, *Ulumul-Bəlağə: Əl-Bəyan vəl-Məani vl-Bədi*, 293.) İzah üçün bir neçə örnəyə diqqət edək.

شيب أيام الفراق مفارقي "Ayrılıq günləri saç ayrımımı ağartdı".

Burada "ağartmaq" və "günlər" sözü həqiqətdir.

أحيا الأرض شباب الزمان " Zamanın gəncliyi yer üzünü canlandırdı".

Burada "diriltmək" və "gənclik" sözü məcazdır.

أهلك الناس الدينار والدرهم "İnsanları dinar və dirhəm həlak etdi".

Burada "həlak" sözü ilə "fitnəyə düçar etmək" nəzərdə tutulduğu görə birinci tərəf məcazdır. İkinci tərəf olan "dinar" və "dirhəm" sözü isə həqiqətdir.

**Əbu Mazinin İstifadə Etdiyi Kinayələr.**

Əbu Mazinin mənzum hekayələrində istifadə etdiyi kinayə onun "*Şair və Ümmət*" isimli mənzum hekayəsinin 19-cu beytində yer almışdır. Həmin beyt belədir:

وطوى رايتها المنتشره

"*Ümmətin açılmış bayrağını bükdü*".

Bu beytdə kralın öz xalqının bayrağını bükməsi dövlətin varlığına son qoyması mənası ifadə edir. Burada murad edilən məna bir vəsf ilə əlaqədar olduğu üçün burada "*məkniyyun anh*" sifətdir. Lakin onun qərib (قريب), yoxsa bəid (بعيد) kinayə olduğu barədə hələ bir şey söyləməmişik. Gəlin bunu da aydınlaşdırmağa çalışaq. Bəlağət kitablarında mətləbi sifət olan kinayənin iki növ (qərib və bəid) olduğu söylənilir. Qərib kinayədə vasitələr az olur və gizlilik olmur. Bəid kinayədə isə tam əksinə olur. Yəni vasitələr çox olur (Əl-Xətibi, *Miftahu Təlxisil-Miftah*, 631). və gizlilik olur) Lakin Əhməd Əmin Şirazi mətləbi sifət olan kinayənin 3 növ olduğunu söyləmişdir. Əhməd Əmin Şirazi bu sözləri belə ardıcıllıq ilə sıralayır. *Vazeh*, *Xəfi* və *Bəid*.(Əş-Şirazi, 1422, p. 238) Əlbəttə ki, Əhməd Əmin Şirazi bu bölgünü özündən ortaya qoymayıb. Onun yazdığı kitabı oxuduqda aydın olur ki, bu kitab Xətib Qəzvininin "*Təlxisu`l-Miftah*" isimli kitabının günümüz üçün sadələşdirilmiş variantıdır. Onun bu söylədiklərini eynisiylə Xətib Qəzvinin "*Təlxisu`l-Miftah*" kitabında tapmaq mümkündür.(M. bin A. Əl-Qəzvini, 2010, p. 112) Əslində, Qəzvini mətləbi sifət olan kinayəni 3 qismə deyil, iki qismə bölmüşdür. Çünki Qəzvini bu bölgünü vasitələrin azlığına və çoxluğuna nəzərən aparmışdır. Qəzvini hesab edirdi ki, mətləbi sifət olan kinayə ya vasitəli ola bilər, ya da vasitəsiz. Qəzvini *vazeh* və *xəfini* vasitəsizdən hesab etmişdir. *Bəid* olanı isə vasitəlidən hesab etmişdir.(El-Kazvînî, 2014, p. 226) Yaxşı olardı ki, Əhməd Əmin Şirazi *vazeh* və *xəfi* kinayənin qəribin növündən olduğunu qeyd edəydi. Misrli alim Hamid Avni mətləbi sifət olan kinayələrdən bəhs edərkən daha diqqətli davranmışdır. O, mətləbi sifət olan kinayəni 2-qismə (*qərib* və *bəid*) bölmüşdür. Sonra isə *qərib* kinayəni isə 2 qismə bölmüşdür və onları *xəfi* və *vazeh* adlandırmışdır.(Avni, n.d., p. 81) Əslində, Hamid Avni də elə Qəzvininin etdiyi şeyi təkrar etmişdir. Deməli, onlar mətləbi sifət olan kinayənin *qərib* növünün vasitəsiz olması məsələsində Qəzvini ilə razılaşıblar. Bəhaəddin Subki də bu məsələdə Qəzvininin yolunu izləmişdir.(Əs-Subki, 2003, p. 2\212)

Kinayənin yuxarıda zikr edilən qaydalarını nəzərə alaraq deyə bilərik ki, barəsində danışdığımız bu beytdə istifadə edilmiş mətləbi sifət olan kinayə növü baxımından *qərib vazeh* hesab edilməlidir, çünki burada vasitələr azdır.

Əbu Mazinin "*Halın Hekayəsi*" isimli mənzum hekayəsinin 17-ci beytində də kinayədən istifadə edilmişdir. Həmin beyt aşağıdakı kimidir.

يكادُ يَمُدُّ الكَفَّ لَو لا بَقِيَّةٌ مِنَ الصَبرِ في ذاكَ الرِداءِ تَجولُ

*Bədənində səbrin qalıqları gəzib dolaşmasaydı, az qalmışdı ki, (dilənçilər kimi) əl açsın.*

Burada *məkni anh* nisbətdir. Şair kinayənin bu qismindən istifadə edərək hekayənin əsas sürətinin səbirli olduğunu söyləmək istəmişdir. Bu beytdə kinayənin növü mətləbi nisbət olan kinayədir.

## Nəticə

Nəticə olaraq söyləyə bilərik ki, biz Əbu Mazinin mənzum hekayələrində kinayənin ləfzi etibarı ilə mətləbi sifət və mətləbi nisbət olan iki növünə rast gəldik. Lakin mətləbi mövsüf olan kinayə növünə rast gəlmədik. Vasitəsi etibarı ilə isə kinayənin ima növünə rast gəldik.

Bütün bu deyilənlərdən belə nəticəyə gələ bilərik ki, kinayə ilə əlaqəli iki şeyə diqqət etməyimiz lazımdır: Birincisi, kinayənin mətləbini düzgün təyin etməliyik. Ondan sonra kinayənin növünü təyin etməliyik. Kinayənin mətləbinin təyini, növünün təyinindən öncə gəlməlidir, çünki mətləbin düzgün təyin edilməsi növün düzgün təyin edilməsinə müəyyən qədər yardımçı olur. Həmçinin, belə bir nəticəyə də gəlmək olar ki, lüzumu gizli olan kinayələr Ərəb şeirini anlamada həm Ərəb dilini bilən əcəmilər, həm də Ərəb oxucular üçün böyük maniədir. Bu maniənin aşılması üçün isə ədəbiyyatda varid olan bəzi kinayələri əzbərləmək lazımdır, ya da ədiblərin kinayələri necə şərh etməsinə baxmaq lazımdır. Kinayələr içərisində ən çətin olanı isə rəmzdir. Rəmzi düşünərək anlamaq, çözmək mümkün deyil. Bir xalqın ədəbiyyatındakı rəmzləri anlamaq üçün gərək həmin xalqın içərsində uzun müddət yaşayasan.

## Ədəbiyyat

1. Atiq, A. (1985). *Fil-Bəlağatul-Arabiyyə: İlmul-Bəyan* (Vol. 2). Darun-Nəhdatil-Arabiyyə Lit-Tibaəti vən-Nəşr.
2. Avni, H. (n.d.). *Əl-Minhacul-Vadih lil-Bəlağa*. Əl-Məktəbətuş-Şamilə.
3. Camiatul-Mədinətil-Aləmiyyə. (2011). *Əl-Bəlağa (1): Əl-Bəyan vəl-Bədi*. Səudiyyə Ərəbistan.
4. El-Kazvînî, E.-H. (2014). *El-Îdâh fî Ulûmi'l-Belâğa*. Dâru'l-Kitâbi'l-Arabî.
5. Əl-Buxari, M. İ. (2008). *Əl-Camius-Sahih min Rivayəti Əbi Zərr əl-Hərəvi* (1st ed.). Şəbəkətu Alukə.
6. Əl-Feyruzabadi, M. M. Y. (2008). *Əl-Qamusul-Muhit*. Darul-Hadis.
7. Əl-Haşimi, Ə. (2013). *Cəvahirul-Bəlağa* (4th ed.). Darul-Marifə.
8. Əl-Xətibi, M. M. (2007). *Miftahu Təlxisil-Miftah* (Vol. 2, 1st ed.). Əl-Məktəbətul-Əzhəriyyə Lit-Turas.
9. Əl-Qəzvini, Əl-Xətib. (2014). *Əl-İdah fi Ulumil-Bəlağa*. Darul-Kitabil-Arabi.
10. Əl-Qəzvini, M. A. (2010). *Təlxisul-Miftah: Məa'l-həvaşil-muntəxabə* (1st ed.). Məktəbətul-Buşra.
11. Əl-Məraği, Ə. M. (2002). *Ulumul-Bəlağə: Əl-Bəyan, Əl-Məani və Əl-Bədi* (Vol. 1, 4th ed.). Darul-Kutubil-İlmiyyə.
12. Əmin, B. Ş. (1982). *Əl-Bəlağatul-Arabiyyə fi Sovbihəl-Cədid: İlmul-Bəyan*. Darul-İlmi lil-Məlayin.
13. Ər-Razi, Ə. Ə. F. (2008). *Mucəmu Məqayisil-Luğa*. Daru İhyait-Turasil-Arabi.
14. Əs-Subki, B. (2003). *Kitabu Arusil-Əfrah fi Şərhi Təlxisil-Miftah* (1st ed.). Əl-Məktəbətul-Asriyyə.
15. Əş-Şirazi, Ə. Ə. (2001). *Əl-Bəliğ fil-Məani vəl-Bəyan vəl-Bədi* (1st ed.). Muəssəstun-Nəşril-İslami.

Daxil oldu: 01.01.2025
Qəbul edildi: 06.04.2025

DOI: https://doi.org/10.36719/2706-6185/47/91-96

**Abderrahmane Laheg**
Kasdi Merbah University-Ouargla, Algeria
https://orcid.org/0009-0000-7315-1967
abderrahmane.laheg.edu@gmail.com

# Necropolitics of the Zone of Nonbeing in the Selected Writing by Tsitsi Dangarembga and Ray Bradbury

## Abstract

In the imperial epoch, social practices of division, classification and differentiation are more than often adopted by sovereignties as means for maintaining absolute authority and solidifying racial discrimination. Binaries such as 'us' and 'them', colonizer and colonized, and master and slave are usually the blueprints of extremist ideological doctrines. Following literary narratives through different contact zones, as that in Tsitsi Dangarembga's *The Book of Not* and Bradbury Ray's short story "Way in the Middle of the Air", a recurring motif of racialized abnegation and annihilation could be discerned. Be it slavery or colonization, Black subjects are entangled in an inevitable neurosis. A simultaneous revision of the theoretical framework of Frantz Fanon and Mbembe Achilles highlights a relevance between two conceptions, which are the zone of nonbeing and necropolitics. Whilst the first term describes the atmosphere that engulfs the existence of Black people who co-exist with White supremacists, necropolitics as introduced by Mbebe explains and distinguishes the mechanisms that manipulate and relegate Black people into this zone of nonbeing. Rereading both fictional works through such a lens foregrounds the imperial autocratic rules manipulating death zones.

***Keywords:*** *abnegation, colonization, contact zones, necropolitics, non-being, slavery*

**Abderrahmane Laheg**
Kasdi Merbah Universiteti-Ouargla, Əlcəzair
https://orcid.org/0009-0000-7315-1967
abderrahmane.laheg.edu@gmail.com

# Tsitsi Dangarembga və Ray Bradbury tərəfindən seçilmiş yazıda yoxluq zonasının Nekropolitika

## Xülasə

İmperatorluq dövründə bölünmə, təsnifat və diferensiallaşmanın sosial praktikaları suverenliklər tərəfindən mütləq hakimiyyəti saxlamaq və irqi ayrı-seçkiliyi gücləndirmək vasitəsi kimi daha çox qəbul edilir. "Biz" və "onlar", müstəmləkəçi və müstəmləkəçi, ağa və qul kimi ikiliklər adətən ekstremist ideoloji doktrinaların planları olur. Tsitsi Dangarembga-nın *The Book of Not* və Ray Bradbury-nin "Way in the Middle of the Air" povestində olduğu kimi müxtəlif təmas zonaları vasitəsilə ədəbi povestlərdən sonra irqiləşdirilmiş imtina və məhvin təkrarlanan motivini görmək olar. İstər köləlik olsun, istərsə də müstəmləkəçilik, qara subyektlər qaçılmaz nevrozun içinə girirlər. Frants Fanon və Mbembe Axillesin nəzəri çəsədinin eyni vaxtda nəzərdən keçirilməsi, yoxluq və nekropolitika zonaları olan iki konsepsiya arasında aktuallığı vurğulayır. Birinci termin ağ supremasistlərlə birlikdə mövcud olan qara insanların varlığını əhatə edən atmosferi təsvir edərkən, Mbembe tərəfindən təqdim edilən nekrosiyasət qara insanları manipulyasiya edən və bu yoxluq zonasına salan mexanizmləri izah edir və fərqləndirir. Hər iki bədii əsəri belə bir obyektiv vasitəsilə yenidən oxumaq ölüm zonalarını manipulyasiya edən imperiya avtokratik qaydalarını ön plana çıxarır.

***Açar sözlər:*** *abneqasiya, müstəmləkəçilik, təmas zonaları, nekropolitika, yoxluq, köləlik*

## Introduction

By the beginning of the 20th century, axiomatic and politically dominant paradigms had been severely questioned and hierarchically deconstructed. The supremacy of ideologies such as colonialism, capitalism and Euro-centrism had been contested with opposite binaries such as postcolonialism, communism and pluralism. As a result, the traditional topos of sovereignty have been rendered obsolete. In other words, the southern hemisphere advocated its presence through consolidating and re-fostering its autochthonous cultures and social norms.

As Mykola Kozlovets clarifies in his research paper, "Europocentrysm: Theory, Ideology and Practice", the brutality of Western oppression and its attempts to erase the native 'other' backfired on the colonizer and fueled the proliferation of subsequent "de-westernization" waves. Such counter-ideologies are easily observed, for instance, in India's "Hinduisation", Middle East's "re-Islamization" and Japan's recourse to Asianization. Through a similar line of thought, maxims of 'Afro-centrism', 'going native' and 'Africana womanism' were celebrated in myriad African countries (Huntington 80-88 qtd. in Kozlovets, 2019, p. 20; Ashcroft et al., 2013, p. 133). In retrospect, such a proclivity towards decolonization and cultural dis-estrangement helps in understanding the former principles and motives that gear-shifted the colonial times.

Notwithstanding the variation and numerousness of colonial tyrannical mechanisms, their logical connectives are reducible and traceable back to the fallacious and rudimentary division of the 'civilized us' and the 'barbaric them'. Such a division generatively purports the veracity of iniquitous practices. Conspicuously, it serves as a constitutional custom vindicating the significance of certain lives over others, based on racial and ethnic grouping. Indeed, an unprofessed yet a ruling code authorities exerted is the racialized regulation of the right to let live or kill.

Such an inexorable imperative has been conceptualized and coined by the Cameroonian philosopher and historian Achille Mbembe first in 2003, as necropolitics. Mbembe detects and unveils the way racist and extremist agendas cement the grounds of inequality, armament, antipathy, and phobias as apparatus to either socio-economically exclude or simply kill the so-alleged adversary of state, religion or ethnicity. The (bio-)necropolitics, as introduced by Mbembe is rather a theoretical amalgamation in between Michele Foucault's biopolitics and Frantz Fanon's conception of the 'zone of non-being' in his book *Black Skin, White Masks* ("Achille Mbembe", 2016; Mbebe, 2019, p. 66; Fanon, 1967, p. 2).

The Black body is rather in a continuous process of (de/re) construction. Fanon demonstrates that any moment of coexistence or contact with the White world is befuddling the Black subject's psyche. Fanon further confirms that both worlds, White and Black "follow the principle of reciprocal exclusivity. No conciliation is possible" (Fanon, 1963, p. 38-39). Even spatial co-habitation does not erase the bold boundaries, that ascend beyond the geographical axis, fending off any form symbiotic relationship. As the self-proclaimed master-race flags the existence of the other as subversive of his own, a set of ex/implicit regulations in form of limitations, classifications and prohibitions permeate the very psychosomatic interactions of the subjugated race.

Literature, in particular, encapsulates the complexities of those encounters between the White colonizer/master and the subjugated Black body. At the same time, literature has been resorted to by writers as a platform for resistance, where numerous genres and literary devices have been weaponized to rewrite history, centralize the margins and remarkably protagonize the antagonized 'other'. The native, after years of being (under-)represented and demonized by the European pen, made a presence in (non-)fictional narratives and voiced his/her existence. Remarkably, literature allows the investigation of phenomena through varied and dissimilar contact zones, which confers the advantage of thorough understanding of the targeted phenomenon. Necropolitics, for instance, is reigning supreme in colonies and slavery zones. Thus, the writing of Tsitsi Dangarembga and Ray Bradbury serve as the practical corpus of this study.

## Research

### Two Zones, One Fate: Contextualization of Dangarembga's and Bradbury's Writing

Tsitsi Dangarembga is a Zimbabwean author who mainly writes in English. She is acclaimed for her series of semi-autobiographies, *Nervous Conditions*, *The Book of Not* and *This Mournable Body*. The books which were published respectively in 1988, 2006 and 2018, follow the adventures and struggles of a young Shona protagonist from the age of thirteen years old till being a middle - aged

women (Flores, 2020, p. 146). The protagonist Tambudzai acquaints the reader with the cultural mores and traditions of her indigenous world. She further discloses the bitter realities of life amidst colonization and war of independence, and finally discusses the prospect of Zimbabwe in line with post-independence and nationalist parties. Simultaneously, Tambu discloses glimpses of the author's own life. Myriad similarities could be observed, such as both the author and the protagonist are graduates of missionary schools. Both of them had direct contact with the British colonizer. Both of them were psychologically wounded and culturally alienated. Conspicuously, none of them escaped the subversive dents of the colonizers' necropolitics ("Achille Mbembe: Biography", 2016).

The contact between the colonizer and the colonized was accentuated most in her second fictional publication, *The Book of Not*. The book thoroughly screened this encounter and its multilayered indications. Two main parallel plotlines guided the book's events. First, it recounts Tambudzai's enrollment at a high school that is pertinent to White British settlers. Second, it lays the ground for the economic and political conditions that preluded the violent outbreak of war of independence by Rhodesian fighters. The first plotline brought about the fact of racial segregation in Tambu's high school and dormitory, and the dehumanizing degradation she endured, from her White classmates (Dangarembga, 2006, p. 66).

The Gruella war of independence cracks unbridgeable political chasms and psychological fragmentation into Tambudzai's identity construction. Amongst her hostile White classmates, she was by no means allowed to display the slightest traces of sympathy towards her sister, who lost her leg in the war (Dangarembga, 2006, p. 30). At the same time, any declared support to the colonizers, who granted her an educational opportunity, would flag her by the resistance fighters as a disloyal spy.

Through a different context Ray Bradbury, of Fahrenheit 451 fame, is prefigured as a voluminous American author, with around 30 books and 600 short stories. Such profuse literary production encompasses a wide variety of genres, ranging from realistic fiction, to fantasy, horror, mystery and science fiction ("Typewriter", 2019; "Ray", 2013). His widely acclaimed work, *The Martian Chronicles*, is a fix-up novel published in 1950. Remarkably, the constituent twenty-seven stories could be classified as sixteen full stories and eleven "bridge[s]", which are rather fragments that serve as nexuses in between the full stories. Worthy of mention, the book had been revised and refined in a published second edition in 1997. Correspondingly, the first edition chronological order starts in January 1999 and concludes in October 2026; the second edition makes a temporal deviation as it opens with January 2030, and spans till October 2057. In spite of the modifications, the time lag of twenty-seven years between the first and last short story is preserved in both editions. In addition, whilst two short stories were inserted within the updated collection, "Way in the Middle of the Air" was withdrawn (Reid, 2000, p. 25-26).

"Way in the Middle of the Air" delves into the depths of White supremacy and the institution of slavery. The short story narrates the sudden gathering of all black slaves, who live in the Southern states of America, around a rocket, which is supposed to help them escape earth altogether and head towards Mars. The outrage of White masters is personified through a racist character, Teece, who demeans the Blacks as useless yet he is utterly furious over their escape. He desperately forbids black man named Belter from joining the rest over a debt of fifty dollars. As the crowd around pays this fifty dollars, Teece directs his anger towards his boy servant Silly. As his attempt of instilling fear inside the Black escapee was futile, he sabotages Silly's plan to escape with a fake contract and vain excuses yet again to no avail (Cruz-Duarte, 2020, p. 22).

### Necropolitics of Colonial Contact Zones in Dangarembga's *The Book of Not*

Tambudzai was implicitly yet persistently guided towards inevitable social and cultural self-abnegation. She was constructed by the White master to inhabit an economic, educational and ideological cul-de-sac. Her diploma, which is identical to that of her White classmates, neither holds the same value nor does it offer the same opportunities. Tambudzai's frustration mirrors such a bitter realization, "I was only marginally better paid than the beggars, who, fulfilling the prophecies of the whites" (Dangarembga, 2006, p. 198).

A prominent necropolitical strategy is that the Black body is repeatedly indoctrinated the axiom, that even diligence and perseverance cannot compensate his/her inherent vice. His/her Blackness

konkretləşdirilməsi və öyrənilən materialın kontekstlə əlaqələndirilməsi baxımından üstünlük təşkil edir. (Crary, 1990).

Şəkil və video materiallar vasitəsilə real həyatdan nümunələrin təqdim olunması tələbələrə mövzuları analiz etmək, müqayisə etmək və tənqid etmək imkanı yaradır. Bu, şagirdlərin tənqidi düşünmə və problem həll etmə bacarıqlarının inkişafına təkan verir. Məsələn, müxtəlif mədəniyyətlərdən gələn vizual materialların müqayisəsi, dil və məna arasındakı əlaqələrin daha dərindən başa düşülməsini təmin edir (Erwin, 2015).

Ənənəvi tədris metodlarından fərqli olaraq, vizual stimullar dərs prosesini daha canlı və interaktiv edir. Təqdim olunan şəkillər, videolar və animasiyalar dərsi monotonluqdan qurtararaq, tələbələr arasında aktiv müzakirələrin və praktiki məşğələlərin yaranmasına şərait yaradır. Bu, həm sinif içi, həm də uzaq tədris şəraitində əhəmiyyətli üstünlük təşkil edir (Fiedler 1999).

Vizual vasitələr dərslərin daha maraqlı və əyləncəli olmasını təmin edir. Rəngarəng şəkillər və hərəkətli videolar şagirdlərin diqqətini cəlb edir, öyrənməyə marağı artırır və onlarda müsbət emosional reaksiyalar yaradır. Bu isə, öyrənmə prosesində motivasiyanı və nəticədə uğurlu dil mənimsənilməsini dəstəkləyir (Peirce, 1958). Hər tələbənin öyrənmə tərzi fərqli olduğundan, vizual stimullar sinifdə fərdi yanaşmanın tətbiqinə imkan yaradır. Görmə vasitəsilə öyrənənlər üçün bu cür materiallar daha təsirli olub, digər duyğu kanallarından istifadə edilən metodlarla müqayisədə daha yaxşı nəticələr verir. Beləliklə, müəllimlər tələbələrin ehtiyaclarına uyğun material seçimi ilə tədris prosesini fərdiləşdirə bilirlər (Baudry, 1994).

Vizual materiallar vasitəsilə tələbələr real həyatdan alınan vizual kontekstlər üzərində dialoq və müzakirələr aparır, situasiyaları təsvir edir və öz fikirlərini ifadə edirlər. Bu metod kommunikativ bacarıqların - xüsusilə danışıq və yazı qabiliyyətinin - inkişafına mühüm töhfə verir. Həmçinin, qrup çalışmalarında və sinif içi interaktiv tapşırıqlarda vizual vasitələr tələbələrin daha fəal iştirakını təmin edir (Mayer, 2009).

Dil təkcə söz və qrammatikadan ibarət deyil, həm də o dilin mənsub olduğu mədəniyyət və həyat tərzinin də ifadə vasitəsidir. Vizual stimullar vasitəsilə təqdim olunan real həyat nümunələri və mədəni kontent tələbələrə öyrəndikləri dilin daşıyıcılarının gündəlik həyatını, adət-ənənələrini və sosial davranışlarını anlamağa imkan verir. Bu isə mədəniyyətlərarası ünsiyyəti inkişaf etdirir və tələbələr arasında empatiyanın formalaşmasına töhfə verir (Goodman, 1996).

Ədəbiyyat və praktiki təcrübələr göstərir ki, vizual stimulların tətbiqi öyrənmə prosesində uğurlu nəticələr verir. Məsələn, sinif daxilində aparılan tədqiqatlarda vizual materiallardan istifadə edilən dərslərdə tələbələrin yaddaş performansının və analitik düşünmə qabiliyyətlərinin əhəmiyyətli dərəcədə artdığı müşahidə edilmişdir. Həmçinin, dil öyrənmə proqramlarında video tapşırıqlar və interaktiv şəkil təhlili metodları tələbələrin motivasiyasını və qatılımını artırmışdır (Goodman, 1996).

## Nəticə

Vizual stimulların istifadəsi zamanı bəzi çətinliklər və məhdudiyyətlər də ola bilər. Texnoloji avadanlıqlara çıxışın məhdud olması, bəzi bölgələrdə rəqəmsal tədris materiallarının çatışmazlığı və ya dil və mədəniyyət fərqlilikləri ilə bağlı anlaşılmazlıqlar kimi problemlər bu metodun tətbiqində maneə yarada bilər. Bu səbəbdən, müəllimlər hər bir dərs üçün ən uyğun və effektli vizual materialları seçməkdə diqqətli olmalı, tələbələrin fərdi öyrənmə tərzlərini və texnoloji imkanlarını nəzərə almalıdırlar.

## Ədəbiyyat

1. Visuelle Medien im DaF-Unterricht. (n.d.). *SciSpace*. https://scispace.com
2. UDL als Hilfsmittel zur Gestaltung diversitätssensiblen Fremdsprachenunterrichts. (n.d.). *ResearchGate*. https://www.researchgate.net/
3. Förderung von Visual Literacy im DaF-Unterricht anhand von Werbeanzeigen. (n.d.). *De Gruyter*. https://www.degruyter.com/

4. Hüseynova, N. T., & Məlikov, M. Ş. (2018). *Xüsusi metodikanın müasir problemləri* (s. 113).
5. U.S. Department of Education. (1990). *The Individuals with Disabilities Education Act (IDEA)*. https://www.ed.gov/laws-and-policy/individuals-disabilities/idea
6. Strategien für das visuelle Lernen und Unterrichten. (n.d.). *Lucidspark*. https://lucidspark.com/
7. Arten von visuellen Hilfsmitteln zum Lernen. (n.d.). *Venngage*. https://de.venngage.com/
8. Digitales Lehren und Lernen im Fachunterricht. (n.d.). *peDOCS*. https://www.pedocs.de/
9. Azərbaycan Respublikası. (2019). *"Ümumi təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu*. https://edu.gov.az/az/de-institutlasma-ve-usaqlarin-mudafiesi_348/umumi-tehsil-haqqinda-azerbaycan-respublikasinin-qanunu_18396
10. Potenzial der Visualisierungen für mediengestütztes Grammatiklernen. (n.d.). *De Gruyter*. https://www.degruyter.com/
11. Pictures for language learning. (n.d.). *Cambridge University Press / peDOCS*. https://www.pedocs.de/
12. Mayer, R. E. (2009). *Multimedia learning* (2nd ed.). Cambridge University Press. https://lucidspark.com/

Daxil oldu: 30.12.2024
Qəbul edildi: 04.04.2025

DOI: https://doi.org/10.36719/2706-6185/47/242-246

**Günel Qafarova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
Magistrant
https://orcid.org/0009-0000-5937-8540
gunelgaffarzadeh@gmail.com

# Stiven Spilberqin kino dilində ev və məkan problemi

## Xülasə

Stiven Spilberqin kinematoqrafiyası insana dair ən fundamental ehtiyaclardan biri olan "evdə olmaq", "evdə hiss etmək" istəyi üzərində qurulan estetik bir axtarışdır. Onun ekran qəhrəmanları tez-tez nə fiziki, nə də mənəvi baxımdan bir evə sahibdirlər. Bu qəhrəmanlar üçün "ev" bəzən itirilmiş bir yaddaşdır, bəzən var olmayan bir gələcəkdir. Bu məqalə rejissorun film irsində "ev" anlayışının necə şəsi travmalarla, kollektiv yaddaşla və sosial-mədəni kimliklə əlaqələndirildiyini araşdırır. Müxtəlif filmlərin analizi göstərir ki, Spilberqin vizual dili müasir insana xas olan "yer tapa bilməmək" hissini estetik forma ilə təqdim etməyə xidmət edir. Qəhrəmanlarının evsizlikləri, bəzən müharibənin, bəzən ailə dağılmasının, bəzən də texnoloji distopiyanın yaratdığı mənəvi və emosional disbalanslar kimi ekranlaşdırılır. Rejissorun şəxsi həyatında yaşadığı köçkünlük, valideynlərinin boşanması və yəhudi kimliyi ilə bağlı qarşılaşdığı çətinliklərin onun kino poetikasında evsizliyin metaforik və simvolik formalarını yaratmışdır. Spilberq üçün "ev" bir yerdən çox, "qəbul olunmaq", "anlaşılmaq", "mənsub olmaq" halıdır. Bu isə sadəcə fiziki bir strukturla deyil, duyğularla, münasibətlərlə və yaddaşla qurulan mənəvi bir sistemdir. Nəticə etibarilə, Stiven Spilberqin filmlərindəki məkan təsviri yalnız vizual təxəyyülün məhsulu yox, həm də onun mənsubiyyət, travma və sağalma ilə bağlı suallarına verdiyi bədii cavabdır. Bu məqalə Stiven Spilberqin kino poetikasında məkan anlayışının funksional və simvolik təhlilinə yönəlmişdir.

***Açar sözlər:*** *Stiven Spilberq, məkan anlayışı, ev motivi, aidiyyət problemi, mənsubiyyət, yadlıq, evsizlik*

**Gunel Gafarova**
Azerbaijan State University of Culture and Arts
Master student
https://orcid.org/0009-0000-5937-8540
gunelgaffarzadeh@gmail.com

# The Problem of Home and Space in Steven Spielberg's Cinematic Language

## Abstract

Steven Spielberg's cinematography represents an aesthetic pursuit rooted in one of the most fundamental human needs: the longing "to be at home" or to "feel at home." His on-screen protagonists frequently lack a home—both physically and emotionally. For these characters, "home" may appear as a distant memory or an imagined, unreachable future. This article examines the ways in which the notion of "home" within the director's body of work connects with personal trauma, collective memory, and socio-cultural identity. Through an analysis of selected films, the study reveals that Spielberg's visual language offers an aesthetic articulation of the modern individual's struggle to situate themselves within a stable sense of place. His characters' states of homelessness emerge through experiences shaped by war, broken families, or technological dystopias, all of which generate psychological and emotional turmoil. Spielberg's personal history—marked by displacement, the divorce of his parents, and the challenges associated with his Jewish identity—has

deeply influenced the symbolic and metaphorical expressions of rootlessness in his cinematic vision. For Spielberg, “home” is not merely a physical setting, but rather a condition of being recognized, understood, and belonging. It is a spiritual construct built through affective ties, relationships, and memory. Ultimately, spatial representation in Spielberg’s films reflects more than artistic imagination; it serves as a poetic response to the existential questions of identity, trauma, and emotional restoration. This article offers a functional and symbolic exploration of space within the framework of Spielberg’s cinematic poetics.

***Keywords:*** *Steven Spielberg, spatial concept, home motif, belonging crisis, identity, alienation, homelessness,*

## Giriş

Stiven Spilberq müasir Amerikan kinematoqrafiyasının ən mühüm rejissorlarından biri olmaqla yanaşı, həm də insan təcrübəsinin ən incə və dərin qatlarını vizual poetikaya çevirə bilən nadir sənətkarlardan biridir. Onun filmləri bəzən kosmik uzaqlıqlara, bəzən də tarixi fəlakətlərin qaranlıq səhnələrinə boylansa da, əslində, daimi “evə qayıdış”, “itirilmiş sığınacaq”, “mənsubiyyət hissi” kimi dərin psixoloji və mənəvi təbəqələrin üzərində qurulub. Rejissorun bədii dünyası həqiqətdə “hardayam?” və “haraya aidəm?” sualları ətrafında formalaşan ontoloji bir narahatlığın vizual təzahürüdür. Spilberqin filmlərində “ev” motivi təkcə çatmaq istənilən bir yer olmaqla bərabər, bəzən itirilmiş təhlükəsizlik, bəzən qorunmağa çalışılan bir xatirə, bəzənsə artıq qayıdılması mümkün olmayan bir illüziyadır (MacCabe, 2003).

**Tədqiqat**

Rejissorun uşaqlıq təcrübələri, əsasən, ailədaxili münasibətlərdə yaşadığı travmalar onun bu mövzuya xüsusi həssaslıqla yanaşmasına zəmin yaratmışdır. O, atasının işi ilə əlaqədar Amerika Birləşmiş Ştatlarının müxtəlif ştatlarna mütəmadi olaraq köç etmək məcburiyyətində qalmışdır. Bu köçkünlük rejissoru daimi bir məkan və sosial münasibətlər qurmaq imkanından məhrum etmişdir. Nəticədə isə “ev” anlayışı onun üçün heç vaxt tam sabit bir məna daşımamışdır. Bundan əlavə, gən yaşlarında antisemit münasibətlərlə qarşılaşması, onun sosial mühitdən təcrid olunmasına və “yad” kimi hiss etməsinə səbəb olmuşdur. Valideynlərinin boşanmasından sonra yaşadığı aidiyyətsizlik və emosional çətinliklər, sonradan Spilberqin filmlərində əsas tematik qayğıya çevriləcəkdir *(McBride, 2011, p. 18).*

Stiven Spilberqin yaradıcılığında bu problematik yanaşmas xüsusi yer tutur. Onun filmlərində məkan problemi sadəcə süjetin baş verdiyi səhnə kimi deyil, həm də qəhrəmanların daxili dünyasını əks etdirən simvolik strukturlar vasitəsilə işlənir. Onun kinematoqrafiyasında “ev” anlayışı vahid və dəyişməz bir məna daşımır. Spilberqin obrazları tez-tez ya doğma yerlərindən fiziki olaraq uzaqlaşdırılmış, ya da yaşadıqları məkanda mənəvi təcrid olunmuş fərdlər kimi təqdim olunur. Bu qəhrəmanlar üçün məkan bir tərəfdən yadlıq hissini dərinləşdirən bir ünsür, digər tərəfdən isə itirilmiş və ya əldə olunmağa çalışılan bir sığınacaqdır. Spilberqin kino dilində məkanın bu cür çoxqatlı işlənməsi, onu yalnız vizual və dekorativ olmaqdan çıxararaq, həm də məna baxımından emosional daşıyıcıya çevirir (Buckland, 2006).

**Kinoda məkan mövzusuna teorik yanaşma**

Spilberqin filmlərindəki personajlar çox zaman sabit məkana malik olmadan, dayanıqsız və keçici yaşam formaları ilə xarakterizə olunurlar; onlar sanki öz talelərindən və həyat hekayələrindən qoparılmış varlıqlardır *(Alba, 2017, p. 22)*

Rejissorun uşaq qəhrəmanın gözü ilə təqdim etdiyi *“Yadplanetli” (E.T. the Extra-Terrestrial, 1982)* filmi ev anlayışını iki fərqli, lakin bir-birini tamamlayan prizmadan təqdim edir: yadplanetli E.T.-nin öz planetinə qayıtmaq arzusu və baş qəhrəman Elliotun öz evində olmasına baxmayaraq, orada mənəvi mənsubiyyət hiss edə bilməməsi.

*“Oz ölkəsinin cadugəri” (The Wizard of Oz, 1939)* filmindəki Doroti Qeyl obrazından bəri bütün uşaqlar kimi E.T. də evə getmək istəyir. *Kowalski, 2008, s. 45)* Digər tərəfdən Elliotun hekayəsi məkanın daxili boşluqla necə bağlı olduğunu göstərir. O, ilk baxışdan ana, bacı, qardaşı əhatə edən tipik bir ailədə yaşayır, lakin bu mühit onun üçün mənəvi baxımdan boşdur. Atasının ailəsini tərk

etməsi evdə daimi bir çatışmazlq hissi yaradır. Elliot ailə üzvləri ilə emosional bağ qura bilmir, evdə özünü "anlaşılmayan" fərd kimi hiss edir. Beləcə, özü kimi "fərqli" gördüyü yadplanetliyə bağlanır. Bu bağ iki evsiz varlığın bir-birində "ev" hissini tapması kimi başa düşülə bilər. Bu film Spilberqin kino dilində ev anlayışını uşaq psixologiyası, yadlıq və mənəvi aidiyyətlik prizmasından izah etdiyi əsərdir. Burada "evə qayıdış" fiziki lokasiyadan çox emosional bütövləşmə və qəbul olunma ehtiyacı kimi qurulub (Kowalski, 2008).

*"Günəş imperiyası" (Empire of the Sun, 1987)* filmində isə "evdən uzaq düşmək" motivi fərdi yox, artıq tarixi və kollektiv travma kontekstində işlənilir. Şanxayda böyüyüən ingilis oğlan Cim İkinci Dünya Müharibəsi zamanı Yaponiyanın şəhəri işğal etməsi nəticəsində valideynlərindən ayrı düşür. O, həyatının üç ilini Yapon ordusunun əsir düşərgəsində keçirməli olur. Bu filmdə Spilberq ev anlayışını bu dəfə mülkiyyət, sosial status və uşağın müdafiəsizliyi ilə əlaqələndirərək təqdim edir. Cim Şanxaydakı lüks Britaniya məhəlləsindəki evindən qoparılması ilə bərabər "ev" artıq təhlükəsiz, dabitlik və aid olunan bir məkan olmaqdan çıxır. Düşərgədə Cimin yaşadıqları həm fiziki yoxsulluq, həm də mənəvi sarsılma ilə müşayiət olunur. Lakin maraqlıdır ki, Cim bu qeyri-məkanda özünün yeni bir həyat ritmini formalaşdırmağa çalışır, mühitə adaptasiya olur, sistemin içində öz rolunu tapır, hətta bir növ ev hissi yaratmağa cəhd edir. Bu film həmçinin, itkinin geri dönməzliyi haqqında poetik və vizual bir düşüncədir (Stubbs, 2013).

Rejissorun *"Şindlerin siyahısı" (Schindler's list, 1993)* ekran əsəri isə yəhudi icmasının fiziki məkanla, yəni ev, küçə, getto və digər yaşayış sahələri ilə bağlarının sistemli qoparılmasını vizual və simvolik olaraq əks etdirir. Məkanın zorla əllərindən alınması fərdlərin eyni zamanda, ontoloji səviyyədə yerdəyişməsinə və mənəvi kimlik travmasına səbəb olmuşdur.

Filmdə məkan yalnız arxa fon funksiyası daşımır, əksinə, dramatik və ideoloji bir göstərici kimi çıxış edir. Krakov gettosunun yaradılması nəticəsində yəhudilərin şəxsi və kollektiv məkanıarə zorla ləğv edilir. Yəhudilərin qatarlarla deportasiyası sadəcə məkan dəyişimi aktı deyil, məkanla olan hüququn və əlaqənin tamamilə qoparılmasıdır. Onlar artıq "öz yerlərində deyillər", amma yeni məkan da onlara aid deyil. Filmin vizual quruluşu da bu məzmunu dəstəkləyir: ağ-qara palitra esteti məkanın insani keyfiyyətlərdən uzaqlaşmasını, istiliyin və həyatiliyin silinməsini simvolizə edir. Filmdə siyahı da metaforik bir dəyər daşıyır. İtzak Stern obrazının dediyi "siyahı həyatdır" ifadəsi bu sənədi mənəvi sığınacaq və xilas məkanı kimi yozmağa imkan verir. Siyahı real fiziki məhrum edilmiş və yurdlarından zorla qovulmuş yəhudilər üçün alternativ ev funksiyası yerinə yetirir (Minuz, 2014).

Filmin əvvəlində nasistlər üçün siyahı sadəcə idarəetmə vasitəsilə ikən, filmin sonunda o, Şindlerin şəxsi və mənəvi məsuliyyətini daşıyan müqəddəs bir kitab funksiyası qazanır. Siyahı artıq ölümə aparan sənəd deyil, həyat üçün açılan yeganə qapıdır. *(Kowalski, 2008, s. 174)* Başqa bir nümunəyə nəzər yetirsək, rejissorun "Sıravi Ryanı xilas etmək" *(Saving Private Ryan, 1998)* filmindəki "ev" anlayışı konkret fiziki bir struktur kimi vizual olaraq ön planda yer tutmasa da, bütün hekayə boyu personajların daxili psixoloji motivasiyası "evə qayıdış" ideyası ətrafında formalaşır. Filmdə Amerika Birləşmiş Ştatlarının hərbi komandanlığının Ryanı geri göndərmək qərarı müharibə kontekstində nadir rast gəlinən humanist intervensiya nümunəsi kimi interpretasiya edilə bilər. Bu qərar dövlətin və kollektivin bir fərdin ailə ilə olan bağınıı qorumaq və mənəvi "ev" ideyasını yaşatmaq üçün göstərdiyi şüurlu səyin təzahürüdür. Filmdə qəhrəmanların evsizliyi konkret məkan kontekstində, yəni dağılmış şəhərlər, boşaldılmış kəndlər, məhv olmuş strukturlar ilə xarakterizə olunur (Morris, 2007).

Stiven Spilberqin *"Süni intellekt" (A.I. Artificial İntelligence, 2001)* filminə eyni kontekstdən nəzər yetirdikdə, süni intellekt əsaslı humanodi robot uşaq Devidin evlə bağlı təcrübəsi ardıcıl travmalarla yüklənmişdir. O, əvvəlcə yerləşdirildiyi ailədən qovulur, daha sonra onu qəbul edə biləcək heç bir sosial struktur və məkan tapa bilmir.

Stiven Spilberqin *"Bacararsansa, tut məni" (Catch me if you can, 2002)* filminə nəzər saldıqda isə bu ilk baxışda hiyləgərliyi ön plana çıxaran bioqrafik triller kimi görünsə də, əslində, dağılmış ailə sistemi, sabit məkandan və şəxsiyyətdən məhrum olma kimi dərin psixoloji və sosial problemləri vizuallaşdırır. Filmin baş qəhrəmanı Frenkin davranışları və seçdiyi strategiyalar valideynlərinin boşanması ilə başlayan və həyatının bütün mərhələlərinə yayılan məkan hissinin itirilməsi və

mənsubiyyət böhranı ilə sıx bağlıdır. Frenkin heç yerə aid ola bilməməsi onu özünü tapmaq üçün başqa insanların şəxsiyyətinə sığınmağa vadar edir (Schober, Olson, 2016).

Rejissorun *"Azlıq hesabatı" (Minority Report, 2002)* filmi texnoloji distopiya çərçivəsində şəxsi məkanın, ailə formasının və mənəvi sabitliyin itirilməsi məsələsini ön plana çəkir. Filmin baş qəhrəmanı Con övlad itkisindən sonra yalnız hüquqi sistem daxilində deyil, həm də fərdi aidiyyət mənasında dərin bir boşluq yaşayır. Onun üçün "ev" anlayışı artıq real bir məkan yox, sadəcə keçmişlə bağlı virtual ailə görüntülərini yaşadan nostaljik bir məkandır. Film boyu evin özü də qaranlıq, cansız, artıq "yuva" funksiyasını itirmiş bir sahə kimi təqdim olunur. Conun keçirdiyi transformasiya eynilə, evindən qoparılmış qəhrəman arxetipinə uyğundur.

Rejissorun *"Terminal" (The Terminal, 2004)* filmində isə beynəlxaq hava limanı fiziki sərhədlərin simvolik və hüquqi mənalarının kəsişdiyi liminal məkan olaraq sosial və psixoloji yurdsuzluğun metaforası kimi təqdim edilir. Filmin baş qəhrəmanı Viktor Navorski Şərqi Avropada yerləşən xəyali Krakoziya Respublikasınan Amerikaya gələrkən ölkəsində baş verən dövlət çevrilişi nəticəsində hüquqi statusunu itirir. Pasportunun etibarsız elan olunması ilə o, nə Amerikaya tam daxil ola, nə də öz ölkəsinə geri qayıda bilir. Beləliklə, beynəlxaq terminal zonasıda bir növ həbs olur. Bu vəziyyət onu nə tam mənada əcnəbi, hə də vətəndaş kimi müəyyənləşdirir. Viktor artıq "hüquqi evindən" məhrumdur (Minuz, 2014).

Hava limanı həm fiziki, həm də sosial baxımdan Viktorun həyatındakı boşluğu təmsil edir. İnsanlar gəlir və gedir, o isə qalır, lakin olduğu yerdə mənəvi olaraq yoxdur. Məhz bu cür keçici sahələr haqqında fransız antropoloq Mark Oje "non-place" (tər. qeyri-məkan, yersiz, yeri olmayan) anlayışını irəli sürüb. Bu termin keçici, funksional, ancaq şəxsi və mənəvi bağ hissi doğurmayan məkanları ifadə edir. Oje belə məkanları hava limanları, otellər, ticarət mərkəzləri, stansiyalar, magistrallar və s. kimi təsnif edib. Spilberqin "Terminal" filmi non-place anlayışını vizual və fəlsəfi səviyyədə təcəssüm etdirən ən yaxşı nümunələrdəndir. Filmdki JFK hava limanı tipik non-place kimi təqdim olunur, qəhrəman Viktor isə bu məkanda sıxışıb qalan obrazdır. Lakin Viktorun limanda keçirdiyi aylar ərzində bu non-place anlayışı tədricən öz mənasını dəyişir. Çünki o, artıq burada dostlar qazanır, gündəlik rituallarını formalaşdırır, hətta mini cəmiyyət qurur. Bu tranformasiya prosesi Spilberqin vizual dili ilə də vurğulanır (Kalinak, 2010).

Stiven Spilberqin məkanla şəxsiyyət arasındakı əlaqəni siyasi və etik konteksdə araşdıran güclü kino nümunələrindən biri *"Münhen" (Munich, 2005)* filmidir. 1972-ci il Münhen Olimpiadasında baş verən terror hadisəsinə cavab olaraq Mossad agentlərinin həyata keçirdikləri gizli əməliyyatlar film boyu müxtəlif ölkələrdə baş verir. Lakin bu coğrafi çoxluq qəhrəman üçün mənəvi bir parçalanmaya çevrilir. Baş qəhrəman Anver üçün ev həm siyasi, həm də şəxsi mənalar daşıyır. Amma bu iki məkan arasında daimi bir konflikt var. O, fiziki olaraq, mütəmadi hərəkətdədir, daimi bir evi yoxdur. Parisdəki mənzil, mehmanxana otaqları, gizli sığınacaqlar, bunların heç biri emosional olaraq ev funksiyasını yerinə yetirmir. Anver yəhudi kimliyini qorumaq üçün ev funksiyasını yerinə yetirmir. Avner yəhudi kimliyini qorumaq üçün bu yola çıxsa da, yolun sonunda öz ölkəsinə aid olub-olmadığını belə sorğulamağa başlayır. Filmin sonunda Avner İsrailə geri qayıdır, lakin artıq o, mənəvi və siyasi olaraq, heç bir yerə aid deyil. Evinə, həyat yoldaşına, uşağına qovuşması belə onu sülhə aparmır. Əksinə, o, indi vəzifəsi bitmiş bir agent, sistemin içində özünə yer tapa bilməyən bir insandır.

Avnerin missiyası bir nəticə yaratmır, əksinə, onun mənsubiyyət hissini sarsıdır. Evə qayıdış təhlükəsizlik deyil, yoxluqla qarşılaşmaqdır *(Friedman, 2006, s. 186).*

Coi adlı atın l Dünya Müharibəsi fonunda başına gələn hadisələri izləyən *"Müharibə atı" (War Horse, 2011)* filmi mənəvi evin itirilməsinin daha bir nümunəsidir. Coi Albi adlı gənc oğlana məxsusdur. Lakin müharibə başlayanda Coi orduya satılır və fiziki olaraq evdən, mənəvi olaraq isə mənsub olduğu ailəsindən qoparılır. Beləcə, həm Coi, həm də Albi üçün ev artıq itirilmiş bir arzuya, uzaq və qeyri-müəyyən bir hədəfə çevrilir. Müharibə dövründə at fərqli insanların, ingilis əsgərlərinin, alman zabitlərinin və s. əllərinə keçir. Ancaq bu insanların heç biri üçün o, mənəvi dəyər daşımır, ya yük, ya texniki vasitə, ya da müharibənin simvoludur. Bu mənada at özü də yeri olmayan bir varlıq halına gəlir. Filmin son səhnəsində Albi ilə Coi yenidən qovuşurlar. Bu isə evə qayıdış aktı kimi qurulur. Lakin onların hər ikisi müharibənin travmasını öz içlərində daşıyırlar. Evə qayıdırlar, lakin o ev artıq eyni ev deyil (Wasser, 2010).

## Nəticə

Stiven Spilberqin kino poetikasında "ev" anlayışı məkan olmaqla yanaşı, həm də dərin simvolik və psixoloji qatlara malik kompleks bir metafora kimi çıxış edir. Rejissorun fərdi təcrübələrindən, uşaqlıq travmalarından, ata ilə münasibətlərindən, kimlik axtarışlarından və yəhudi mənsubiyyətindən qidalanan bu estetik istiqamət onun filmlərindəki məkan təqdimatlarını həm fərdi, həm kollektiv səviyyədə oxumağa imkan verir. Spilberqin obrazları üçün "ev" bəzən itirilmiş bir keçmiş, bəzən arzulanan bir gələcək, çox zaman isə real olmayan, ideallaşdırılmış bir sığınacaqdır. Stiven Spilberqin rejissorluğunun özünəməxsusluğu onun şəxsi təcrübələrindən qaynaqlanan emosional və psixoloji təbəqələri universal kinematoqrafik dillə ifadə edə bilməsində təzahür edir. Bu baxımdan, Spilberqin filmləri müasir insanın yersizliyi, sosial parçalanması və mənəvi təcridinə dair ekran ifadəsinin refleksiyaya çevrilir.

## Ədəbiyyat

1. Alba, F. (2017). *El cine fantástico de Spielberg*. Ediciones Encuentro.
2. Buckland, W. (2006). *Directed by Steven Spielberg: Poetics of the contemporary Hollywood blockbuster*. Continuum.
3. Friedman, L. D. (2006). *Citizen Spielberg*. University of Illinois Press.
4. MacCabe, C. (2003). *Steven Spielberg*. British Film Institute.
5. Morris, N. (2007). *The cinema of Steven Spielberg: Empire of the light*. Wallflower Press.
6. McBride, J. (2011). *Steven Spielberg: A biography* (2nd ed.). University Press of Mississippi.
7. Minuz, A. (2014). *Steven Spielberg*. Il Castoro.
8. Stubbs, J. (2013). *Historical film: A critical introduction*. Bloomsbury Academic.
9. Schober, A., & Olson, D. (Eds.). (2016). *Children in the films of Steven Spielberg*. Lexington Books.
10. Kalinak, K. (2010). *Film music: A very short introduction*. Oxford University Press.
11. Kowalski, D. A. (Ed.). (2008). *Steven Spielberg and philosophy: We're gonna need a bigger book*. The University Press of Kentucky.
12. Wasser, F. (2010). *Steven Spielberg's America*. Polity Press.

Daxil oldu: 16.01.2025
Qəbul edildi: 21.04.2025

ISSN: 2706-6185
e-ISSN: 2709-4197

DOI: https://doi.org/10.36719/2706-6185/47/247-250

**Səbuhi İsazadə**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
https://orcid.org/0009-0003-4821-4120
sabuhisazada2002@gmail.com

# Maliyyə innovasiyalarının təşviqində regional siyasətlərin rolu

## Xülasə

Maliyyə innovasiyaları iqtisadi inkişafın sürətləndirilməsi və dayanıqlı maliyyə sisteminin formalaşdırılması baxımından mühüm əhəmiyyət daşıyır. Bu prosesdə regional siyasətlər əsas vasitələrdən biri kimi çıxış edir və müxtəlif bölgələrin maliyyə resurslarına çıxış imkanlarını artırmaqla iqtisadi tarazlığı təmin edir. Regional siyasətlər, maliyyə texnologiyalarının tətbiqini stimullaşdırmaq, kiçik və orta bizneslərin maliyyələşməsini asanlaşdırmaq və investisiya mühitini gücləndirmək üçün spesifik strategiyalar təqdim edir. Bundan əlavə, regional siyasətlər yerli maliyyə institutlarının inkişafını təşviq edərək, əhalinin maliyyə xidmətlərinə çıxış imkanlarını genişləndirir və maliyyə inklüzivliyini artırır. Bu çərçivədə, rəqəmsal ödəniş sistemləri, mikromaliyyə alətləri və alternativ investisiya platformaları kimi maliyyə innovasiyaları, regionlarda iqtisadi fəallığı gücləndirməyə kömək edir. Beləliklə, maliyyə innovasiyaları ilə regional siyasətlərin inteqrasiyası, həm iqtisadi inkişafın coğrafi baxımdan balanslaşdırılmasına, həm də uzunmüddətli dayanıqlı maliyyə infrastrukturunun formalaşdırılmasına xidmət edir. Bu yanaşma, xüsusilə inkişaf etməkdə olan ölkələrdə regional bərabərsizliyin azaldılmasında və makroiqtisadi sabitliyin qorunmasında strateji əhəmiyyət daşıyır.

***Açar sözlər:*** *regional siyasətlər, investisiya təşviqi, rəqəmsal maliyyə, kredit, maliyyə*

**Sabuhi Isazadeh**
Azerbaijan State Economic University
Master student
https://orcid.org/0009-0003-4821-4120
sabuhisazada2002@gmail.com

# The Role of Regional Policies in Promoting Financial Innovation

## Abstract

Financial innovations are of vital importance in accelerating economic development and establishing a sustainable financial system. In this context, regional policies act as a key instrument by improving access to financial resources across different areas, thereby ensuring economic equilibrium. These policies offer targeted strategies to stimulate the use of financial technologies, facilitate the financing of small and medium-sized enterprises (SMEs), and enhance the investment environment. Furthermore, regional policies support the development of local financial institutions, expanding public access to financial services and promoting financial inclusion. Within this framework, financial innovations such as digital payment systems, microfinance instruments, and alternative investment platforms help boost economic activity in the regions. As a result, the integration of financial innovations with regional policies contributes both to geographically balanced economic development and the creation of a long-term, sustainable financial infrastructure. This approach is of strategic significance, particularly in developing countries, in reducing regional disparities and maintaining macroeconomic stability.

***Keywords:*** *regional policies, investment promotion, digital finance, credit, finance*

## Giriş

Maliyyə innovasiyaları müasir iqtisadi sistemlərin inkişafında mühüm rol oynayır və regionların maliyyə xidmətlərinə çıxış imkanlarını genişləndirmək üçün effektiv vasitələrdən biri kimi çıxış edir. Rəqəmsal texnologiyaların sürətli inkişafı və qlobal iqtisadi inteqrasiya fonunda maliyyə sahəsində yeniliklərin tətbiqi getdikcə daha vacib hala gəlir (Azərbaycan Respublikası, 2016, s. 157). Bu innovasiyalar regionların iqtisadi potensialını artırmaqla yanaşı, yerli sahibkarların maliyyələşmə imkanlarını genişləndirir və yeni investisiya mənbələri yaradır. Regional siyasətlər isə maliyyə innovasiyalarının tətbiqini təşviq edərək bölgələrin iqtisadi inkişafına təkan verir (OECD, 2011, s. 99). Dövlət tərəfindən aparılan strategiyalar, yerli maliyyə institutlarının gücləndirilməsi və rəqəmsal infrastrukturun inkişaf etdirilməsi bu prosesin əsasını təşkil edir. Regionlarda innovativ maliyyə həllərinin geniş tətbiqi kiçik və orta biznes subyektlərinin böyüməsini stimullaşdırır, bankçılıq xidmətlərinin əlçatanlığını artırır və iqtisadi fəaliyyətin diversifikasiyasına şərait yaradır (Rodríguez-Pose, 2013). Bu mövzuda regional siyasətlərin maliyyə innovasiyalarına təsirini və onların sosial-iqtisadi inkişafa gətirdiyi faydaları araşdırmaq mühüm əhəmiyyət kəsb edir. Xüsusilə, maliyyə texnologiyalarının bölgələrdə tətbiqi, tənzimləyici mexanizmlərin effektivliyi və rəqəmsal transformasiyanın regional iqtisadiyyata təsiri kimi məsələlər ön plana çıxır (The Global Economy, n.d., s. 55).

**Tədqiqat**

**Regional İnkişafda Maliyyə İnnovasiyalarının Strateji Əhəmiyyəti**

Müasir iqtisadiyyatın dinamik inkişafı fonunda maliyyə innovasiyalarının tətbiqi regionların sosial-iqtisadi inkişafında mühüm rol oynayır. Yeni maliyyə texnologiyaları və rəqəmsal həllər vasitəsilə yerli sahibkarların kapitala çıxışı asanlaşır, investisiya mühiti yaxşılaşır və maliyyə resurslarının səmərəli bölgüsü təmin edilir. Xüsusilə, rəqəmsal bankçılıq, blokçeyn əsaslı maliyyə sistemləri və alternativ maliyyələşdirmə metodları regionların iqtisadi dayanıqlılığını artırmağa imkan yaradır (Vəliyev, 2011; Pike, Rodríguez-Pose, Tomaney, 2006). Regional inkişaf strategiyalarında maliyyə innovasiyalarının nəzərə alınması iqtisadi tarazlığın təmin olunmasına və bölgələr arasında fərqlərin azaldılmasına kömək edir. Bu istiqamətdə həyata keçirilən siyasətlər, yeni texnologiyaların tətbiqinə dəstək verilməsi və yerli biznes subyektləri üçün maliyyələşdirmə imkanlarının genişləndirilməsi regionların rəqabət qabiliyyətini artırır (Sadygov, 2003). Həmçinin, dövlət və özəl sektor arasında əməkdaşlıq modeli formalaşdırılaraq maliyyə texnologiyalarının daha geniş miqyasda tətbiqinə şərait yaradılır. Rəqəmsal transformasiya və innovativ maliyyə həllərinin bölgələrdə yayılması üçün infrastrukturun inkişafı, maliyyə savadlılığının artırılması və texnoloji biliklərin təkmilləşdirilməsi əsas prioritetlərdən biridir (Uyarra, Flanagan, 2010, s. 61).

**Cədvəl 1. Regional Maliyyə İnnovasiyalarının Təsiri Üzrə Statistik Göstəricilər.**

| Region | Rəqəmsal Bankçılıq İstifadə (%) | KOB-ların Rəqəmsal Maliyyələşməsi (%) | İnvestisiya Məbləği (mln AZN) | Maliyyə Savadlılığı İndeksi (0-100) |
|---|---|---|---|---|
| Bakı | 85 | 75 | 500 | 80 |
| Gəncə-Qazax | 65 | 55 | 200 | 60 |
| Şəki-Zaqatala | 50 | 40 | 150 | 50 |
| Lənkəran | 55 | 45 | 170 | 55 |
| Quba-Xaçmaz | 45 | 35 | 120 | 45 |
| Aran | 60 | 50 | 180 | 58 |
| Dağlıq Şirvan | 40 | 30 | 90 | 40 |
| Naxçıvan | 70 | 65 | 220 | 65 |

**Mənbə:** Azərbaycan Respublikası (2016). Azərbaycan Respublikasında maliyyə xidmətlərinin inkişafına dair Strateji Yol Xəritəsi. Bakı.

Cədvəldə müxtəlif regionlarda maliyyə innovasiyalarının tətbiq səviyyəsi və onların iqtisadi göstəricilərə təsiri əks olunub. Rəqəmsal bankçılıq istifadəsi Bakı şəhərində ən yüksək səviyyədədir, burada bu göstərici 85% təşkil edir. Digər regionlarda isə bu rəqəm 40%-70% arasında dəyişir ki, bu da rəqəmsal maliyyə xidmətlərinə çıxış imkanlarının bölgələrə görə fərqləndiyini göstərir (Selvam, Kalyanasundaram, 2020). Kiçik və orta bizneslərin rəqəmsal maliyyələşmə imkanlarına baxıldıqda, ən yüksək göstəricinin 75%-lə Bakı şəhərində olduğu görünür. Bu, regionda inkişaf etmiş maliyyə infrastrukturunun və innovativ maliyyələşdirmə mexanizmlərinin geniş yayılmasının nəticəsidir. Digər bölgələrdə bu göstərici nisbətən aşağıdır və 30%-65% arasında dəyişir ki, bu da regionlarda rəqəmsal maliyyə həllərinin daha da inkişaf etdirilməsinə ehtiyac olduğunu göstərir (Boschma, 2005; McCann, Ortega-Argilés, 2015). İnvestisiya məbləği baxımından da ciddi fərqlər müşahidə olunur. Bakı ən yüksək investisiya həcminə malikdir (500 milyon AZN), bu isə digər bölgələrlə müqayisədə daha çox maliyyə axınının və biznes imkanlarının burada cəmləşdiyini göstərir. Digər regionlarda bu göstərici 90 milyon AZN-dən 220 milyon AZN-ə qədər dəyişir, bu isə yerli iqtisadiyyatın inkişaf səviyyəsinə uyğun dəyişiklikləri əks etdirir. Maliyyə savadlılığı indeksinə nəzər saldıqda, Bakı və Naxçıvan ən yüksək göstəriciyə malikdir (80 və 65 bal), digər regionlarda isə bu göstərici 40-60 arasında dəyişir. Bu, maliyyə biliklərinin və rəqəmsal xidmətlərdən istifadə bacarıqlarının regionlar üzrə qeyri-bərabər olduğunu göstərir (Asheim, Isaksen, 2002; Tödtling, Trippl, 2005). Ümumilikdə, cədvəldə əks olunan məlumatlar regionlarda maliyyə innovasiyalarının yayılması və istifadəsi sahəsində fərqli səviyyələrin mövcud olduğunu göstərir. Rəqəmsal bankçılığın və maliyyə texnologiyalarının daha geniş yayılması üçün bölgələrdə infrastrukturun inkişaf etdirilməsi və maliyyə savadlılığının artırılması vacibdir. Bu istiqamətdə həyata keçirilən tədbirlər, həmçinin kiçik və orta bizneslərin maliyyə resurslarına daha asan çıxışını təmin edərək regional iqtisadi inkişafı sürətləndirə bilər (Feldman, Kogler, 2010; Zhou, Li, 2025).

## Nəticə

Maliyyə innovasiyalarının regionlarda geniş tətbiqi iqtisadi inkişafı sürətləndirmək, sahibkarlıq mühitini gücləndirmək və maliyyə xidmətlərinə çıxış imkanlarını artırmaq üçün mühüm rol oynayır. Rəqəmsal texnologiyalar, fintech həlləri və alternativ maliyyə mexanizmləri regionların iqtisadi dayanıqlılığını və rəqabət qabiliyyətini artıraraq yeni imkanlar yaradır. Kiçik və orta sahibkarların maliyyə resurslarına çıxışını asanlaşdırmaq, nağdsız ödəniş sistemlərini genişləndirmək və rəqəmsal bankçılıq xidmətlərini əlçatan etmək regionların iqtisadi dinamikliyini artırır. Dövlətin və özəl sektorun bu sahədə birgə fəaliyyəti innovasiyaların daha effektiv şəkildə tətbiqinə imkan yaradır. İnfrastrukturun inkişaf etdirilməsi, tənzimləyici çərçivələrin uyğunlaşdırılması və maliyyə savadlılığının artırılması regionlarda rəqəmsal transformasiyanın uğurla həyata keçirilməsinə şərait yaradır.

## Ədəbiyyat

1. Asheim, B. T., & Isaksen, A. (2002). Regional innovation systems: The integration of local 'sticky' and global 'ubiquitous' knowledge. *The Journal of Technology Transfer, 27*(1), 77–86. https://doi.org/10.1023/A:1013100704794
2. Azərbaycan Respublikası. (2016). *Azərbaycan Respublikasında maliyyə xidmətlərinin inkişafına dair Strateji Yol Xəritəsi*. Bakı.
3. Azərbaycan Respublikası. (2018). *2018–2020-ci illərdə Azərbaycan Respublikasında rəqəmsal ödənişlərin genişləndirilməsi üzrə Dövlət Proqramı*. Bakı.
4. Boschma, R. (2005). Proximity and innovation: A critical assessment. *Regional Studies, 39*(1), 61–74. https://doi.org/10.1080/0034340052000320887
5. Cooke, P. (2001). Regional innovation systems, clusters, and the knowledge economy. *Industrial and Corporate Change, 10*(4), 945–974. https://doi.org/10.1093/icc/10.4.945
6. Feldman, M. P., & Kogler, D. F. (2010). Stylized facts in the geography of innovation. In B. H. Hall & N. Rosenberg (Eds.), *Handbook of the Economics of Innovation* (Vol. 1, 381–410). Elsevier. https://doi.org/10.1016/S0169-7218(10)01010-0

7. McCann, P., & Ortega-Argilés, R. (2015). Smart specialization, regional growth and applications to European Union cohesion policy. *Regional Studies, 49*(8), 1291–1302. https://doi.org/10.1080/00343404.2013.799769
8. OECD. (2011). *Regions and innovation policy*. OECD Publishing. https://www.oecd.org/en/publications/regions-and-innovation-policy_9789264097803-en.html
9. Pike, A., Rodríguez-Pose, A., & Tomaney, J. (2006). *Local and regional development*. Routledge. https://doi.org/10.4324/9780203478629
10. Rodríguez-Pose, A. (2013). Do institutions matter for regional development? *Regional Studies, 47*(7), 1034–1047. https://doi.org/10.1080/00343404.2012.748978
11. Sadygov, E. (2003). *Rynok tsennykh bumag v Azerbaydzhane i perespektivy yego razvitiya*. Sankt-Peterburq.
12. Selvam, M., & Kalyanasundaram, P. (2020). *IT enabled services and ICT industry: Growth & determinants*. Retrieved from https://www.globalbizresearch.org/Chennai_Symposium/conference/pdf/C549.pdf
13. The Global Economy. (n.d.). *Stock market capitalization rankings (2018)*. Retrieved from https://ru.theglobaleconomy.com/rankings/stock_market_capitalization/
14. Tödtling, F., & Trippl, M. (2005). One size fits all? Towards a differentiated regional innovation policy approach. *Research Policy, 34*(8), 1203–1219. https://doi.org/10.1016/j.respol.2005.01.018
15. Uyarra, E., & Flanagan, K. (2010). From regional systems of innovation to regions as innovation policy spaces. *Environment and Planning C: Government and Policy*, *28*(4), 681–695. https://doi.org/10.1068/c0961
16. Vəliyev, E. N. (2011, iyul 13–15). Şəffavlığın təmin olunmasında maliyyə nəzarətinin rolu. *Gənc alimlərin I Elm festivalı elmi konfransı*, 157–160. Bakı.
17. Zhou, Y., & Li, Y. (2025). Impact of regional finance reform and innovation policies on green innovation. *Economic Analysis and Policy, 78*, 123–135. https://doi.org/10.1016/j.eap.2025.01.007

Daxil oldu: 31.12.2024
Qəbul edildi: 05.04.2025

DOI: https://doi.org/10.36719/2706-6185/47/251-255

**Mələk Məmmədova**
Azərbaycan Rəssamlıq Akademiyası
magistrant
https://orcid.org/0009-0008-5046-0204
mmelek02@gmail.com

# Heykəltəraş Görüş Babayevin yaratdığı "Kitabi-Dədə Qorqud" abidəsinin bədii-estetik xüsusiyyətləri

### Xülasə

Azərbaycan heykəltəraşları içərisində Əməkdar rəssam Görüş Babayevin özünəməxsus yeri vardır. Heykəltəraş gənc yaşlarından mükəmməl ixtisas təhsili almış, əvvəlcə Ə.Əzimzadə adına Azərbaycan Dövlət Rəssamlıq Məktəbini bitirmişdir. Sonra Sankt-Peterburqdakı Rəssamlıq Akademiyasında monumental heykəltəraşlıq üzrə təhsilini davam etdirmişdir. Vətənə döndükdən sonra isə akademik Ömər Eldarovun emalatxanasında biliklərini təkmilləşdirməklə məşğul olmuşdur. Onun yaratdığı əsərlər içərisində Mirzə Şəfi Vazeh, Nizami Gəncəvi, 20 Yanvar şəhidlərinə abidə və b. xüsusi olaraq fərqlənir. Sankt-Peterburqdakı Nizami Gəncəvi heykəlinin müəllifi də Görüş Babayevdir. Uzun müddət Türkiyədə əmək fəaliyyəti ilə məşğul olmuş Görüş Babayevin əsərləri həmin ölkədə də ucaldılmışdır. Türkiyənin Ərzurum şəhərindəki "Arfa çalan qız" abidəsi, ümumilikdə Türkiyəyə həsr olunmuş "Türkiyə yuxuları" silsiləsi onun yaradıcılığının məhsuludur. Görüş Babayevin son illərdə yaratdığı abidələr içərisində "Kitabi-Dədə Qorqud" abidəsinin öz yeri vardır. 2013-cü ildə Bakının görkəmli yerlərindən birini tutan Dədə Qorqud parkında ucaldılan bu abidə indiyədək bu eposa – "Kitabi-Dədə Qorqud" eposuna həsr edilən heykəllərdən və digər sənət əsərlərindən fərqlənir. Azərbaycan incəsənətində Dədə Qorqud eposuna çoxlu əsərlər həsr edilmişdir. Hətta eposun 1300 illik yubileyi təmtəraqlı şəkildə keçirilən zaman müsabiqə də elan edilmişdir. Müsabiqə qalibsiz bitsə də, həmin dövrün qabaqcıl incəsənət xadimlərinin böyük əksəriyyəti öz əsərləri ilə müsabiqədə iştirak etmişlər. Görüş Babayevin yaratdığı abidə həmin müsabiqəyə təqdim olunan əsərlərdən onunla fərqlənir ki, bu abidəyə qədər rəssamlar və heykəltəraşlar əsasən Dədə Qorqud obrazının özünə diqqəti yönəldir, sadəcə bu obrazı yaratmaqla kifayətlənirdilər. Görüş Babayev isə öz əsərini bütövlükdə eposa həsr etməyi qərara alır və belə bir sənət əsəri yarada bilir. Heykəltəraş bu əsəri ilə eposun möhtəşəmliyini verməyi qarşısına məqsəd qoyur. Məqalədə bu abidənin sənətkarlıq xüsusiyyətlərindən bəhs açılır.

***Açar sözlər:*** *Görüş Babayev, "Kitabi-Dədə Qorqud", abidə, dastan, heykəl, heykəltəraş*

**Malak Mammadova**
Azerbaijan State Academy of Fine Arts
Master student
https://orcid.org/0009-0008-5046-0204
mmelek02@gmail.com

# Artistic-Aesthetic Features of the Monument "Kitabi Dada Gorgud" Created by Sculptor Gorush Babayev

### Abstract

Among the Azerbaijani sculptors, the Honored Artist Gorush Babayev has a special place. The sculptor received an excellent specialized education from a young age, at first, he graduated from Azerbaijan State Art Fine School named after A.Azimzadeh. Then he continued his studies in monumental sculpture at the Academy of Fine Arts in St. Petersburg. After returning to his homeland, he was engaged in improving his knowledge in the workshop of academician Omar Eldarov. Among

the works created by him the different monuments to such as Mirza Shafi Vazeh, Nizami Ganjavi, to the martyrs January 20 and others differ specifically. The author of the Statue of Nizami Ganjavi in St. Petersburg also belongs to Gorush Babayev. The works by Gorush Babayev, who has been engaged in labor activity in Turkey for a long time, were also erected in that country. The monument "The Girl Playing The Harp" in Erzurum in the city of Erzurum in Turkey, the series "Dreams of Turkey", dedicated to Turkey in general, is a product of his work. Among the monuments created by Gorush Babayev in recent years, the monument "Kİtabi Dada Gorgud" has its place. Erected in 2013 in the park of Dede Gorgud, which occupies one of the prominent places in Baku, this monument differs from the sculptures and other works of art dedicated to this epic "Kitabi Dada Gorgud". Many works have been devoted to the epic Dede Gorgud in Azerbaijani art. A competition was even announced when the 1300th anniversary of the epic was held. Although the competition ended without a winner, the majority of the leading art figures of that time took part in the competition with their works. The monument created by Gorush Babayev differs from the works submitted to the competition in that before this monument, artists and sculptors mainly focus on the image of Dede Gorgud himself, but are content with creating this image, they are content with just creating this image. Gorush Babayev decided to devote his work to the epic as a whole and was able to create such a work of art. The sculptor aims to convey the grandeur of the epic with this work. In the article it is told about the features of the craft of this monument.

***Keywords:*** *Gorush Babayev, "Kitabi Dada Gorgud", monument, epic, statue, sculptor*

## Giriş

Görüş Babayev Azərbaycan heykəltəraşlıq məktəbinin görkəmli nümayəndələrindən biri kimi dəyərli əsərləri ilə sənət aləmində tanınır. Onun yaradıcılığına nəzər saldıqda, sadə insanların obrazlarından başlayaraq, tarixi, ədəbi və siyasi xadimlərə həsr olunmuş portretlər, kompozisiyalar və monumental abidələrlə zəngin olduğunu görmək mümkündür. Onun yaratdığı əsərlər arasında xüsusilə seçilənlərdən biri "Kitabi-Dədə Qorqud" abidəsidir ki, öz orijinallığı ilə daim insanların diqqətini cəlb edir.

"Kitabi-Dədə Qorqud" ümumtürk ədəbiyyatının yeganə yazılı eposu olaraq bütün dövrlərdə aktuallığını qoruyub saxlamış, təkcə Azərbaycan ədəbiyyatının deyil, ümumilikdə dünya ədəbiyyatının nadir incilərindən biri hesab edilmişdir. Ümumiyyətlə, heykəltəraşlıqda eposa, mifə, nağıla, folklor qəhrəmanlarına müraciət çox geniş yayılmışdır və tarixi baxımdan da qədim dövrlərə gedib çıxır. "XVIII–XIX əsrlərin qovşağında klassisizm dövründə, antiklik rus mədəniyyətində mərkəzi yer tutan zaman bir çox yazıçılar, rəssamlar, heykəltəraşlar və digər incəsənət xadimləri məşhur qədim yunan süjetlərinə müraciət edirdilər" (Cəbrayıloğlu, 2011, s. 4).

Şifahi xalq ədəbiyyatına, eposa müraciət zamanı hər bir sənətkar, rəssam və heykəltəraş öz əsərinə ənənədən, eposdan gələn cəhətlərlə yanaşı, öz fərdi üslubunu da yansıdırdı. Bu rəssamlar erkən qədim yunan klassikasının ənənələrinə əsaslanaraq və eyni zamanda intuisiya ilə hərəkət edərək, heykəltəraşlıq kompozisiyalarına daha çox poeziyaya xas olan bir lirizm gətirirdilər (Bulycheva, 2022, s. 69).

**Tədqiqat**

Qeyd edilən əsər xalqımızın ən qədim yazılı abidələrindən biri olub, on iki boydan ibarətdir. Hər boy müstəqil süjet xəttinə malik olub, qədim Oğuz türklərinin həyat tərzini, adət-ənənələrini və döyüş ruhunu əks etdirir. Boyların müəllifliyi Dədə Qorquda aid edilir və o, Oğuz türklərinin yolgöstərən müdriki kimi tanınır. Dastanın müqəddiməsində Dədə Qorqudun Məhəmməd peyğəmbər dövründə yaşadığı və onunla görüşdüyü qeyd edilir (Xəlilov, 2004, s. 12). Bəzi orta əsr mənbələrində isə türklər tərəfindən elçi kimi göndərildiyi barədə məlumatlara rast gəlinir.

Tədqiqatçılar hesab edirlər ki, dastanın boyları ilk dəfə XI əsrdə "Kitabi-Dədəm Qorqud" adı ilə yazıya alınıb. Müasir dövrdə bizə məlum olan iki əsas əlyazma nüsxəsi mövcuddur. Bunlardan biri Almaniyanın Drezden şəhərində saxlanılan və müqəddimə ilə birlikdə on iki boydan ibarət olan nüsxə, digəri isə İtaliyanın Vatikan şəhərində saxlanılan və altı boydan ibarət olan əlyazmadır (Kitabi-Dədə Qorqud, 1988, s. 23). Hər iki nüsxənin XVI əsrdə üzü köçürüldüyü qeyd edilir. 1972-ci ildə Drezden nüsxəsi Bakıya gətirilmiş və geniş tədqiq olunmuşdur.

2019-cu ildə İranda dastanın yeni bir əlyazması aşkar edilmişdir. Bu əlyazma "Türkmən-Səhra" və ya "Günbəd əlyazması" adlandırılaraq tanınmışdır (Nağısoylu, 2021, s. 23). Əski Xorasan vilayətinin Günbəd şəhərindən olan mühəndis Vəli Məhəmməd Xoca tərəfindən bukinist mağazasında üzə çıxarılan bu nüsxə 31 vərəqdən ibarətdir və XVIII əsrin sonlarında Təbrizdə hazırlandığı ehtimal olunur. Onun paleoqrafik xüsusiyyətləri və dil özəllikləri əsərin orijinallığını təsdiq edir (Dədə, 2004, s. 45). Kitabda Dədə Qorqudun soylamaları və eposun baş qəhrəmanı Qazan xan haqqındakı bir boy yer alır.

Akademik K. Əliyev dastanın başqa sahələrə təsiri haqqında yazır: "*Kitabi-Dədə Qorqud* təkcə ədəbi şah əsər deyil. Yalnız orijinal dil mətni də deyil. O, türklərin, oğuzların mifoloji anlayışlarının, əfsanəvi həyatlarının güzgüsüdür. Bu əsərdə, mifdən əfsanəyə, əfsanədən dastana, eposdan tarixi həyata keçid izlənilə bilər. Bu səbəbdən əsər bir çox elmin araşdırma sahəsinə daxil olur: dilçilik, ədəbiyyatşünaslıq, şifahi xalq ədəbiyyatı (mif, əfsanə, dastan, xalq şeiri, adətlər və s.), semiotika, tarix, sosiologiya... Onun müasir ədəbiyyat və incəsənətdə əks olunması da ayrıca araşdırılmalı bir sahədir" (Əliyev, 2019, s. 3).

2000-ci ildə Azərbaycanda *Kitabi-Dədə Qorqud*un 1300 illik yubileyinin qeyd olunması çərçivəsində Dədə Qorqudun portretinin yaradılması üçün təşkil edilən müsabiqə, müstəqillik dövründə təsviri sənətdə tarixi janrın inkişafına əhəmiyyətli bir töhfə verməli idi (Cəbrayıloğlu, 2011, s. 4). Lakin müxtəlif subyektiv amillər səbəbilə yarışma gözlənilən nəticəni vermədi. Müsabiqəyə müxtəlif nəsilləri təmsil edən tanınmış rəssamların əsərləri təqdim edildi. Münsiflər heyəti qarşısında isə ən uğurlu portreti müəyyənləşdirmək kimi çətin bir vəzifə dayanırdı.

Bu yarışı daha da maraqlı edən məqam, müsabiqədə iştirak edən namizədlər arasında Azərbaycan təsviri sənətinin görkəmli simalarının – Tahir Salahov, Oqtay Sadıqzadə, Altay Hacıyev, Asif Azərelli, Arif Mərdan, İsmayıl Məmmədov, Vaqif Ucatay, Sakit Məmmədov və digər tanınmış rəssamların olması idi. Onların hər biri fərqli üslubda Dədə Qorqud obrazını yaratmağa çalışmış, öz sənətkar baxışını təqdim etmişdi.

"Tətbiqi və təsviri incəsənət sahələrində bu dastana bütün türk xalqları tərəfindən maraq göstərilməkdədir. Dastanda adıçəkilən şəxslərin, hadisələrin baş verdiyi ərazilərin sözlə təsvir edilməsindən istifadə edilərək əsərlər yaradılmağa başlanılmışdır. Obrazların geyimi, məkan və s. hər bir xalqın özünəməxsus tərzinə uyğun verilməsi ilə seçilir. Dədə Qorqud baş qəhrəmanlardan biri sayılaraq diqqət mərkəzində olmuş, fərqli üz cizgiləri ilə verilməsinə baxmayaraq, qopuzu özü ilə təsvir edilmişdir. Lakin son dövrlərdə bir sıra təsviri sənət nümayəndələrinin əsərlərində bu obraza olan münasibət fərqli istiqamətdə inkişaf etməkdədir" (Quliyev, 2016, s. 22).

Bu portretlərin hər biri sənətkarlıq baxımından maraqlı və özünəməxsus idi. Lakin əksəriyyətində Dədə Qorqudun ruhuna uyğun mənəvi-psixoloji dərinlik tam şəkildə əks olunmamışdı. Tarixdən də məlum olduğu kimi, Dədə Qorqud yalnız dastan qəhrəmanı deyil, eyni zamanda xalqın mənəvi yolgöstəricisi, bilicisi və hikmət rəmzi idi (Muradoğlu, 2014, s. 7). Məhz bu xüsusiyyətləri dolğun şəkildə əks etdirən portreti tapmaq çətin idi.

Bununla belə, təqdim edilən əsərlər arasında xüsusilə seçilən və obrazın xarakterinə daha yaxın olan rəsmlərdən biri Asif Azərelliyə məxsus idi. O, Dədə Qorqudu qayalıq üzərində əyləşmiş halda, arxa fonda geniş Azərbaycan mənzərəsi ilə təsvir etmişdi. Bu əsərin diqqətçəkən cəhəti rəssamın Dədə Qorqudun xarakterini və müdrikliyini daha ifadəli və inandırıcı təqdim edə bilməsi idi. Rəng palitrası və işıq-kölgə oyunları ilə kompozisiya ahəngdar qurulmuşdu. Ağ saqqalı, parlaq geyimi və dərin düşüncəyə qərq olmuş çöhrəsi Dədə Qorqudun müdriklik rəmzi olduğunu açıq şəkildə əks etdirirdi. Əsərdə onun baxışlarındakı uzaqgörənlik və iç dünyasındakı dərin müdriklik incəliklə işlənmişdi.

Bu portret sadəcə bir simanı deyil, həm də xalqın ruhunu, tarixi yaddaşını və min illərlə yaşayan eposun mahiyyətini əks etdirməyə çalışırdı. Rəssam Dədə Qorqudu yalnız fiziki cizgilərlə deyil, onun daşıdığı mənəvi yük və hikmət dolu baxışları ilə təqdim etməyə müvəffəq olmuşdu. Bu xüsusiyyətlərinə görə Asif Azərellinin yaratdığı portret müsabiqədə ən uğurlu əsərlərdən biri kimi qiymətləndirilmişdi.

Baxmayaraq ki, 2000-ci ildə *Kitabi-Dədə Qorqud*un 1300 illik yubileyi rəsmi şəkildə qeyd edildi, bu münasibətlə Dədə Qorqudun portretinin yaradılması üçün keçirilən müsabiqə yekunlaşdırılmadı

və bu məsələyə sonrakı illərdə yenidən baxılmadı. Lakin zaman keçdikcə bu möhtəşəm ədəbi abidəyə bədii baxışın formalaşdırılmasına ehtiyac daha çox hiss olunurdu.

Məhz bu məqsədlə, metronun "Gənclik" stansiyası yaxınlığındakı parkın yenidən qurulması zamanı ərazinin qədim eposla əlaqələndirilməsi qərara alındı. Burada ucaldılacaq heykəlin təkcə Dədə Qorquda deyil, bütövlükdə eposa həsr edilməsi isə məntiqli seçim idi.

2013-cü ildə açılışı baş tutan *Kitabi-Dədə Qorqud* abidəsi öz bədii ifadə tərzi ilə dastanın dərin məzmununa uyğun şəkildə ərsəyə gətirilmişdi. Çünki bu epos xalqımızın fəlsəfəsini, mənəvi dəyərlərini, adət-ənənələrini özündə birləşdirən ən dəyərli abidələrdən biridir.

Bu heykəlin yaradılmasının əsas səbəblərindən biri də, əsrlərdir dillər əzbəri olan Dədə Qorqudun indiyə qədər konkret bir heykəl obrazında canlandırılmaması idi. Heykəltəraş qarşısında çətin bir vəzifə dayanırdı: eposun mahiyyətini və onun ən mühüm siması olan Dədə Qorqudun bütün məziyyətlərini özündə cəmləşdirən bir abidə yaratmaq. Heykəlin kompozisiya quruluşu simvolik məna daşıyır. Ümumi görünüşü həm qocaman bir ağacı, həm də açılmış kitabı xatırladır. Buradakı ağac, kökləri yerə bağlı olub budaqları səmaya ucalan bir metaforadır. Hündürlüyü 4,5 metr olan tunc abidənin səthi müxtəlif çıxıntı və relyeflərlə işlənmiş, üzəri isə "Kitabi-Dədə Qorqud" dastanının obrazları və qəhrəmanlarının təsviri ilə bəzədilmişdir. Yaradıcılığında hər zaman ənənə və müasirlik duyulan heykəltəraş müsahibələrinin birində belə demişdir: "Nə yaxşı ki, mən o vaxt Leninqradda qalmadım. Əgər belə olsaydı, mən bütünlüklə Azərbaycana məxsus rəssam ola bilməzdim. Əsərlərimdə azərbaycançılıq o qədər də hiss olunmazdı. Heykəldəki ağac bir simvoldur. Kökü yerdə, amma özü səmaya yüksələn bir ağac. Bu məni daha çox düşündürürdü. Düzdür, bu günə qədər yaratdığım heykəllərin hər biri öz fəlsəfəsinə uyğun olaraq çətin, düşündürücü və məsuliyyətli işlər olub" (Azəri, 2014, s. 8).

Əməkdar incəsənət xadimi, sənətşünaslıq üzrə fəlsəfə doktoru Ziyadxan Əliyevin qeyd etdiyi kimi, "Görüş Nurəddinoğlunun sənətinin mahiyyətində onun vətəndaşlıq mövqeyi kifayət qədər görünəndir və bu mənada çoxsaylı əsərləri şərəf və borcun cəm halındakı ifadəsidir" (Əliyev, 2013, s. 35).

Görüş Babayevin yaratdığı "Kitabi-Dədə Qorqud" abidəsi qədim adət-ənənələrimizi, xalqımızın tarixi yaddaşını və yurdumuzu yadelli işğalçılardan qoruyan igidlərimizin qəhrəmanlığını özündə əks etdirən bədii bir ifadədir. Heykəltəraş bu eposu yalnız sadə bir heykəl kimi deyil, möhtəşəm bir azman ağac və açılmış kitabın vəhdəti şəklində təsvir edərək, onun həm keçmişin, həm də gələcəyin rəmzi olduğunu vurğulamışdır.

Abidənin ümumi görünüşü uzaqdan baxıldıqda dərhal diqqət çəkir, onun monumental və simvolik mahiyyəti tamaşaçıya güclü təsir bağışlayır. Lakin abidəyə yaxından nəzər yetirdikdə, plastik səth boyunca səpələnmiş zəngin məna qatları aşkar olunur. Burada yalnız təsviri elementlər deyil, həm də eposun dərin fəlsəfəsi və ideya dünyası hiss olunur. Hər bir detal tamaşaçını dastanın ruhuna qovuşdurur, onu bu qədim irsin canlı şahidinə çevirir. Abidə sadəcə bir memarlıq nümunəsi deyil, eyni zamanda xalqın keçmişi ilə bu günü arasında körpü yaradan, milli dəyərlərimizi gələcək nəsillərə çatdıran əvəzsiz sənət əsəridir.

Görüş Babayevin bu monumental əsərində dastanın müqəddiməsi və on iki boyu vizual şəkildə canlandırılmışdır. Burada Oğuz türklərinin tarixi, qəhrəmanlıq ruhu, mədəniyyəti və ənənələri bəşəri idealların təcəssümü kimi təqdim olunur və bu epik irsin dünya xalqlarının mənəvi xəzinəsinə aid olduğu vurğulanır. Əsərdə diqqət çəkən əsas elementlərdən biri Dədə Qorqudun qopuzla təsvir edildiyi kompozisiyadır. O, bütün elinə yol göstərən, insanlara düzgün yaşamağı öyrədən müdrik bir obraz kimi işlənmişdir. Rəssamın ustalığı sayəsində Dədə Qorqudun ağ saqqalı və bəyaz saçları ilə əhatələnmiş, dərin düşüncəyə dalmış çöhrəsi müdrikliyi, hikməti və təcrübəni özündə birləşdirən güclü bir təsir bağışlayır. Bu obrazın dolğunluğu və ifadəliliyi abidəni daha cəlbedici və yaddaqalan edir.

Heykəltəraş bu abidəni sadəcə dekorativ bir element kimi deyil, "Kitabi-Dədə Qorqud" dastanının hadisələrini günümüzə daşıyan, tamaşaçını məlumatlandıran bir sənət əsəri kimi işləyib. Abidənin ən böyük dəyəri onun dastanın süjetlərini canlandıraraq tamaşaçıya Oğuz yurdları, qəhrəman igidlər və keçmişdən gələcəyə ötürülən unudulmaz həqiqətlər haqqında dolğun təsəvvür verməsidir. Bu heykəl adət-ənənələrimizi, xalqımızın mənəvi kodlarını gələcək nəsillərə çatdıran, milli kimliyimizi bütün

dünyaya tanıdan mühüm bir bədii əsərdir. Necə ki, hər bir insanın öz kimliyi var, eləcə də kimliyə sahib olan millətlər mövcuddur. "Kitabi-Dədə Qorqud" Azərbaycan xalqının kimliyidir və bu kimliyin dünyaya təqdim edilməsi, şübhəsiz ki, dövlətimizin üzərinə düşən əsas vəzifələrdən biridir.

## Nəticə

Bütün bu xüsusiyyətlər nəzərə alındıqda əminliklə söyləmək olar ki, abidə milli-mənəvi dəyərlərimizin bədii ifadəsi olaraq bu missiyanı uğurla yerinə yetirmək gücündədir. Bu səbəbdən də bu monumental əsərin tamaşaçılar üçün daim aktual və maraqlı olacağına böyük inam var.

## Ədəbiyyat

1. Azəri, L. (2014, fevral 28). Səmaya boylanan rənglər. *Mədəniyyət qəzeti*, s. 8.
2. Bulycheva, Ye. I. (2022). Antichnyye reministsentsii v mifopoetike skul'ptury Aristida Mayolya. *Aktual'nyye problemy vysshego muzykal'nogo obrazovaniya*, 1(63), 69–73.
3. Cəbrayıloğlu, E. (2011, aprel 12). Heykəltəraşın real görünən arzusu. *Ədalət qəzeti*.
4. Dədə Qorqud Kitabı. (2004). *Ensiklopedik lüğət*. Bakı: Öndər Nəşriyyat.
5. Əliyev, K. (2019). *Dədə Qorqud* (Əsərləri 10 cilddə, VII cild). Bakı: Elm və Təhsil.
6. Əliyev, Z. (2013). *Plastikanın poetik çalarları*. Bakı: SBS.
7. Xəlilov, N. (2004). *Qopuzdan saza Dədə Qorqud dünyası: Məqalələr*. Bakı: Öndər Nəşriyyat.
8. Kitabi-Dədə Qorqud. (1988). (F. Zeynalov & S. Əlizadə, Tərt.). *Bakı: Yazıçı*.
9. Quliyev, R. (2016). Müstəqillik dövründə Dədə Qorqud obrazına yeni baxış. *İncəsənət və mədəniyyət problemləri: Beynəlxalq Elmi Jurnal*, 4(58), 22–30.
10. Muradoğlu, N. (2014, fevral 2). "Kitabi-Dədə Qorqud" abidəsi Azərbaycanın milli kimliyidir. *Xalq qəzeti*, s. 7.
11. Nağısoylu, M. (2021). *"Kitabi-Dədə Qorqud"un Günbəd əlyazması*. Bakı: Elm və Təhsil.
12. Utemova, L. (n.d.). *Antichnyye mify v kamne*. Culture.ru. https://www.culture.ru/materials/183055/antichnye-mify-v-kamne

Daxil oldu: 11.01.2025
Qəbul edildi: 16.04.2025

DOI: https://doi.org/10.36719/2706-6185/47/256-259

**Xalid Həşimov**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
UOT: 791.43
https://orcid.org/0009-0002-8475-5357
khaleedhashimov@gmail.com

# "Əqrəb mövsümü" teleserialının janr və xüsusiyyətləri

## Xülasə

Bu məqalədə "Əqrəb mövsümü" bədii serialının janr xüsusiyyətləri və dramaturji quruluşunun təhlili aparılmışdır. Serialda proloq və epiloq daxil olmaqla, klassik üfüqi struktur formalarından istifadə olunur. "Əqrəb mövsümü" serialı bütün bu struktur və bədii elementləri keyfiyyətli şəkildə tətbiq edir. Serialın hər epizodu hadisələri xatırladan rekaplarla başlayır, dramatik klifhengerlərlə bitir və müxtəlif sosial qruplardan olan personajların taleləri qurulmuş mürəkkəb süjet planı ilə düzəldir. Eyni zamanda, serial və kollektiv dramları bir araya gətirərək tamaşaçının həm fərdi, həm də ictimai inkişafı düşündürür.

Rejissor Emil Quliyevin çəkdiyi bu serial yayımlandığı gündən etibarən geniş tamaşaçı kütləsinin rəğbətini qazanmışdır. Serialın süjet xətti güc və nüfuz sahibi olan Amanovlar ailəsinin həyatında baş verən hadisələri əks etdirir. Əsas qəhrəmanlar Azər Aydəmir və Hikmət Rəhimovun canlandırdığı müstəntiq obrazları süjetin mərkəzi fiqurlarını təşkil edir. Serialın detektiv janrında olması tamaşaçı marağını xüsusilə artırmışdır. İctimai televiziya tərəfindən yayımlanan "Əqrəb mövsümü" son illərin ən uğurlu ekran əsərlərindən biri kimi dəyərləndirilir.

Açar sözlər: janr, üfüqi seriallar, obraz, ellips, rekap, klifhenger

**Khalid Hashimov**
Azerbaijan State University of Culture and Arts
Master student
UOT: 791.43
https://orcid.org/0009-0002-8475-5357
khaleedhashimov@gmail.com

# Genre and Characteristics of TV series "Scorpion Season"

## Abstract

This article deals with the analysis of the genre and features of the " Scorpion Season" fiction series. The series uses classic horizontal structural forms, including prologue and epilogue. The series "Scorpion Season" applies all these structural and artistic elements in a qualitative way. Each episode of the series begins with recaps reminiscent of events, ends with dramatic cliffhangers and follows the fates of characters from different social groups with a complex plot plan. At the same time, by combining serial and collective dramas, it makes the viewer think about both individual and social development. This TV series, directed by Emil Guliyev, has gained great popularity from the audience since its release. The series describes what happened to the powerful and influential "Amanovlar" family. Azar Aydamir and Hikmat Rahimov played the main roles of the investigator and are the main heroes of the series. The fact that the series is in the detective genre has made viewers more interested. The series broadcast by "Public" television is considered one of the most successful projects of recent years.

***Keywords:*** *genre, horizontal series, image, ellipsis, recap, cliffhanger*

## Giriş

Televiziya serialları struktur və məzmununa görə üfüqi (horizontal) və şaquli (vertikal) olmaqla iki əsas növə bölünür. "Əqrəb mövsümü" serialı bu təsnifatda üfüqi seriallar kateqoriyasına aid edilir. Buna görə də, serialın təhlili zamanı bu növün struktur qanunauyğunluqları xüsusi diqqətə alınmalıdır. Üfüqi seriallar xüsusi struktur və bədii elementlərlə fərqlənir ki, bunlardan da ən mühüm olanları rekap (recapitulation), filler və klifhenger (cliffhanger) kimi bədii priyomlardır (Borowiecki, 2024).

Rekap serial daxilində artıq təqdim edilmiş hadisələrin yenidən xatırlanmasını təmin edən bədii üsuldur. Bu, təşkil edici element kimi üfüqi seriallarda xüsusilə əhəmiyyət kəsb edir. Rekap daha çox Türkiyə istehsallı seriallarda üçüncü şəxsin rəvayəti və ya qəhrəmanların xatirələrini tamaşaçıya təqdim etməsi üzrə istifadə olunur. Bu texnika təkcə əvvəlki hadisələri tamaşaçının yadına salmaqla kifayətlənmir, həm də gələcək epizodlar üçün zəmin yaradan alət rolu oynayır ("3", s. 120). Rekap bəzən texniki məhdudiyyətləri ötmək – məsələn, material çatışmazlıqları və ya süjet xətlərini yenidən qiymətləndirmək məqsədi ilə istifadə edilir (Mehdi, 2023).

**Tədqiqat**

Fillerlər isə rekapın struktur baxımından yaxın bənzəridir. Onlar serialın əsas hadisə xəttinə birbaşa təsir etməyən, lakin onu dərinləşdirən əlavələrdir. Fillerlər epizodlar arasında keçirici funksiyanı da yerinə yetirərək tamaşaçı marağını qoruyub saxlayır (Qafarova, 2018).

Klifhenger strategiyası üfüqi serialların digər əhəmiyyətli priyomudur. Bu texnika süjetin ən gərgin nöqtəsində hadisələri dayandırır. Nəticədə tamaşaçının diqqəti məhz növbəti epizoda yönəlir. Bu texnikanın təməl məqsədi emosional gərginliyin qorunması, eyni zamanda tamaşaçı marağının davam etməsidir. Bu baxımdan klifhengerlər intriqalı hadisələrin kulminasiyasına paralel gərginlik yaradan manipulyativ vasitələrdir (Özçınar, 2010).

Üfüqi serialların struktur baxımından ən çox tətbiq olunan model proloq və epiloq daxil olmaqla, dördmərhələli və ya beşmərhələli struktur formalarına əsaslanır. Proloqlar epizodun ilk dəqiqələri ərzində konfliktin təqdim edilməsi üçün işlədilir. Bu hissələrdə tamaşaçılara əsas motiv və problematik məsələlər təqdim edilir. Serial daxilindəki epiloqlar səhnələrin gərgin sonluqları ilə bərabər, növbəti epizodun əsasını qoyur (Wirz, Ort, Rasch, Fahr, nd).

"Əqrəb mövsümü" serialı üfüqi serial strukturunun xüsusiyyətlərini incəliklərə qədər istifadə edən nümunələrdəndir. Serial rekapdan ardıcıl şəkildə faydalanır; hər epizod keçmiş hadisələrin xülasəsini verir. Bu xülasələr Raufun kriminal macəraları və ya Kənanın ailə problemləri kimi əhəmiyyətli süjet xətlərini yenidən qabardır. Hər bir epizod gözlənilməz dramatik hadisələrlə sona çatır: məsələn, Nurlanın oğurlanması və ya qəhrəmanın şəxsi faciələrini əks etdirən digər təsirli səhnələr (Mittel, 2015).

Serial fərqli sosial təbəqələrdən olan insanların talelərini birləşdirən ortaq hadisələr üzərində qurulub. Bu ortaq nöqtələr mürəkkəb hadisələr şəbəkəsi kimi çıxış edir və serialın təsir, eləcə də əhatəliliyini genişləndirir. Serialda cəmiyyətin müxtəlif təbəqələrindən olan insanların həyatlarını əks etdirən vəziyyətlər, onların hər birinin üzləşdiyi sosial, iqtisadi və psixoloji problemlər aydın formada diqqətə çatdırılır. Hekayə həm fərdi dramları, həm də kollektiv mənzərəni nümayiş etdirir. Bu, izləyicilərə həm öz həyatlarını, həm də cəmiyyətin ümumi mənzərəsini daha dərindən anlamağa kömək edir (Newman, Levine, 2012).

Serialda paralel süjet xətləri diqqətəlayiq şəkildə göstərilmişdir. Raufun kriminal intriqaları ilə Kənanın şəxsi həyatdan qaynaqlanan emosional konfliktləri eyni vaxtda təmsil olunur. Paralel süjetlərin hər biri özünəməxsus gərginlik yaradan strukturla təqdim edilir. Bu, tamaşaçı marağını qorumaqda təsirli rol oynayır. Çünki ayrı-ayrı paralel süjet xətləri əslində bir nöqtədə bir-biriləri ilə əlaqəlidir və hekayənin daha yaxşı formada anlaşılmasına xidmət edir (Quliyev, 2020).

Adətən, detektiv obrazlarının vizual fərqləndirilməsi onların xarakter dinamikasını daha aydın göstərməyə kömək edir. Belə ki, klassik detektiv janrında xarakterlərin xarici görünüş fərqliliyi onların xüsusiyyətlərini vurğulamaq üçün tez-tez istifadə edilir. Amma "Əqrəb mövsümü" serialında Kənan və Rauf arasında fikir ayrılıqları olsa da, zahiri fərqlilikləri tam gözə çarpmır (Lotman, 1990).

"Əqrəb mövsümü" bədii qəhrəmanların real şəxsiyyətlər kimi formalaşdırılması üzrə zəngin nümunədir. Kənan, böyük emosional çətinliklərlə üzləşən, lakin eyni zamanda qətiyyətli addımlar ata bilən protaqonistdir. Onun daxili konfliktləri tamaşaçılarda empatiya yaradaraq diqqəti artırır (Bordwell, 2008). Raufun kriminal dünyada göstərdiyi emosional zəifliklər onun mürəkkəb obrazını tamamlayır. Serial eyni zamanda sevgi, ailə, intiqam və xəyanət kimi bədii konfliktləri yüksək intensivliklə əks etdirir. Ümumiyyətlə, obrazların bir-biri ilə olan əlaqələrində, bəzən gözlənilməz və ya həddindən artıq gərgin anlar yaranır və bu halların intensivliyi seriala xüsusi bir dinamiklik qatır (Jenkins, 2006).

Serialın psixoloji aspektləri də xüsusi qeyd edilməlidir. Hekayədəki hər bir xarakter, daxili konfliktləri və qarşı-qarşıya olduğu seçimləri ilə izləyicini öz dünyasına cəlb edir. Burada göstərilən psixoloji vəziyyətlər, cəmiyyətin müxtəlif təbəqələrinin həyatını əks etdirərkən həm də onları müxtəlif psixoloji sınaqlarla üzləşdirir (Bal, 2009).

Zaman sıçrayışları və süjet manipulyasiyaları, "Əqrəb mövsümü" serialını digər seriallardan fərqləndirən əhəmiyyətli xüsusiyyətlərdir. Hər epizodun sonunda təqdim olunan açıq sonluqlar həm tamaşaçı marağını qoruyur, həm də növbəti bölümlərin ssenari əsasını hazırlayır. Serialı izləyən tamaşaçı məntiqi ardıcıllığı anlayır və hadisələrin bəzən hissəli verilməsi serialın marağını daha da artırır. Serial üfüqi serial istehsalı üzrə innovativ texnikaları uğurla nümayiş etdirir (Hüseynli, 2018).

Serialda istifadə olunan bəzi simvollar və metaforalar müxtəlif şərhlərə və dərin təhlillərə imkan yaradır. Məsələn, "əqrəb" simvolu, həm tələlərdən qaçmağı, həm də tələyə düşməyin qorxusunu simvollaşdırır. Digər bir simvolizm isə Vaqifin ad günündəki rəqsidir. Nümayiş olunan rəqs Vaqifin daxilindəki ziddiyyətləri əks etdirir (Kozloff, 1992). Bu rəqs yalnız bir nəğmə və hərəkət deyil, daha çox iç dünyasının ifadəsidir. O, bu rəqs vasitəsilə öz məyusluğunu, narahatlığını, sevgisini və ümumiyyətlə, yaşadığı emosional çətinlikləri tamaşaçıya ötürür. Rəqs burada simvolik bir dil kimi çıxış edir. Sözlərlə ifadə edə bilmədiyi hər şeyi bədən dili və musiqi vasitəsilə açığa çıxarır. Bu an onun həyatındakı məyusluğun və gərginliyin bir növ həlli kimi rol oynayır və eyni zamanda daxili bir etiraz kimi də qiymətləndirilə bilər (Əsədova, 2021).

## Nəticə

Nəticə olaraq, qeyd olunmalıdır ki, "Əqrəb mövsümü" serialı üfüqi serial strukturunun mürəkkəbliyini və zənginliyini tam şəkildə özündə əks etdirən, təhlil üçün geniş imkanlar yaradan bir nümunə olaraq önə çıxır. Serialın psixoloji, sosial və bədii aspektləri, obrazların daxili konfliktləri və süjetin çoxşaxəli quruluşu, tamaşaçının intellektual və emosional təcrübəsini zənginləşdirir. Eyni zamanda serialda istifadə olunan simvollar və metaforalar hekayənin dərinliyini artırır və izləyicinin hadisələri daha fərqli bir prizmadan görməsinə imkan verir. "Əqrəb mövsümü" televiziya serialı müasir televiziya istehsalında tətbiq edilən yenilikçi yanaşmaları və texnikaları ilə həm Azərbaycan, həm də beynəlxalq səviyyədə diqqətəlayiq bir nümunə olaraq qalır.

## Ədəbiyyat

1. Bal, M. (2009). *Narratologiya: Povest nəzəriyyəsinə giriş*. Toronto Universiteti Mətbuatı.
2. Bordwell, D. (2008). *Kino poetikası*. Routledge.
3. Borowiecki, A. (2024). Əsas süjet, paralel və ya epizodik süjet xətti? Serial hekayələrində süjetlər məsələsi. *Media – Mədəniyyət – Sosial Ünsiyyət, 20*, 49–62.
4. Əliyeva, L. (2019). Serial mədəniyyəti və tamaşaçı davranışı. *Mədəniyyət və İncəsənət Jurnalı, (4)*, 31–38.
5. Əsədova, T. (2021). Simvol və metaforaların televiziya seriallarında təhlili. *Filologiya və Sənətşünaslıq Məcmuəsi, (1)*, 60–66.
6. Hüseynli, Ş. (2018). Televiziya seriallarında sosial qrupların nümayəndələri. *Humanitar Elmlər Jurnalı, (2)*, 45–53.
7. Jenkins, H. (2006). *Konvergensiya mədəniyyəti: Köhnə və yeni medianın toqquşduğu yer*. New York University Press.

8. Kozloff, S. (1992). Povest nəzəriyyəsi və televiziya. In R. C. Allen (Ed.), *Channels of discourse, reassembled* (pp. xx–xx). Şimali Karolina Universiteti Mətbuatı.
9. Lotman, Y. (1990). *Ağıl kainatı: Mədəniyyətin semiotik nəzəriyyəsi*. İndiana Universiteti Nəşriyyatı.
10. Mehdi, N. (2023, 4 mart). Bir az da kinosemiotika haqqında ("Əqrəb mövsümü" teleserialı məqsədi). *Ədəbiyyat qəzeti*, 4–5.
11. Mittel, J. (2015). *Kompleks TV: Müasir televiziya hekayələrinin poetikası*. New York University Press.
12. Newman, M. Z., & Levine, E. (2012). *Televiziyanın qanuniləşdirilməsi: Medianın konvergensiyası və mədəni vəziyyəti*. Routledge.
13. Özçınar, M. (2010). *Sinematografik zaman və mekân'ın yaranmasında felsefi arxa plan* (Doktora tezi). Dokuz Eylül Universiteti, Güzel Sanatlar Enstitüsü, Sinema – TV Anasanat Dalı, İzmir.
14. Qafarova, G. (2018). *Ssenari yaradıcılığı 2 (Televiziya serialları)*. Bakı: Dərs vəsaiti.
15. Quliyev, A. (2020). Müasir televiziya seriallarında süjet strukturu və bədii komponentlər. *Azərbaycan Jurnalistika Məcmuəsi, (3)*, 118–125.
16. Wirz, D. S., Ort, A., Rasch, B., & Fahr, A. (n.d.). Cliffhangers serial əyləncədə rolu: Cliffhangers'ın həzz, oyanış və izləməyə davam etmək niyyətinə təsiri ilə bağlı təcrübə. *Psixologiya Elmi, 12*(2), 186–196.

Daxil oldu: 23.01.2025
Qəbul edildi: 28.04.2025

DOI: https://doi.org/10.36719/2706-6185/47/260-263

**Naz Budaqova**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0000-8257-0709
naz.budagova19@gmail.com

# Alman dili dərslərində ədəbi mətnlərin rolu: didaktik və metodoloji baxış

## Xülasə

Son illərdə xarici dil tədrisində, xüsusilə də alman dili dərslərində ədəbi mətnlərin və bədii ədəbiyyatın rolu yenidən aktuallaşmışdır. Ədəbi materiallardan istifadə tələbələrdə dil bacarıqlarının (dinləmə, danışma, oxu və yazı) inkişafına, həmçinin onların mədəni dəyərləri və fərqli baxış bucaqlarını anlama qabiliyyətinə müsbət təsir göstərir. Məqalədə qeyd olunur ki, bədii mətnlər yalnız dil öyrənmək üçün deyil, həm də öyrənilən xalqın mədəniyyətini tanımaq və tələbələrin emosionalintellektual inkişafını dəstəkləmək üçün də mühüm vasitədir.

Didaktik və metodoloji baxımdan, bu cür mətnlər tədris prosesində tənqidi düşüncə, müstəqil yanaşma və interkultural anlayışların formalaşmasına kömək edir. Eyni zamanda, məqalədə ədəbi materiallara audio-vizual resursların əlavə olunmasının tələbələrin motivasiyasını artırdığı və dərsləri daha effektiv etdiyi qeyd olunur.

Nəticə etibarilə, alman dili dərslərində ədəbi mətnlərdən istifadə tələbələr üçün həm linqvistik, həm də mədəni baxımdan zəngin tədris mühiti yaradır və bu yanaşma xarici dil öyrənməsinin əsas məqsədlərinə əhəmiyyətli töhfə verir.

***Açar sözlər:*** *ədəbi mətnlər, alman dili tədrisi, xarici dil öyrənmə, didaktik yanaşma, mədəniyyətlərarası kommunikasiya*

**Naz Budagova**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0000-8257-0709
naz.budagova19@gmail.com

# The Role of Literary Texts in German Language Lessons: Didactic and Methodological Perspectives

## Abstract

In recent years, the role of literary texts and fiction in foreign language education, especially in German language classes, has regained significance. The use of literary materials positively influences the development of students' language skills (listening, speaking, reading, and writing), as well as their ability to understand cultural values and different perspectives. The article emphasizes that literary texts serve not only as a tool for language learning but also as an important means of familiarizing students with the culture of the target language and supporting their emotional and intellectual development.

From a didactic and methodological perspective, such texts contribute to the development of critical thinking, independent learning approaches, and intercultural awareness in the educational process. The article also notes that incorporating audiovisual resources into the study of literary materials increases students' motivation and enhances the effectiveness of lessons.

As a result, the use of literary texts in German language instruction creates a linguistically and culturally rich learning environment for students and makes a significant contribution to the overall

 

goals of foreign language learning
***Keywords:*** *literary texts, german language teaching, foreign language learning, didactic approach, intercultural communication*

## Giriş

Müasir dövrdə xarici dil öyrənmənin məqsədi təkcə yeni dil biliklərinin mənimsənilməsi ilə məhdudlaşmır, eyni zamanda öyrənilən dilin mədəniyyəti, sosial konteksti və ünsiyyət formalarının dərk edilməsini də əhatə edir. Bu baxımdan, ədəbi mətnlər və bədii ədəbiyyat xarici dil tədrisində mühüm rol oynayan didaktik vasitələrdən biri kimi ön plana çıxır. Xüsusilə alman dili dərslərində ədəbi materiallardan istifadə, tələbələrin dil bacarıqlarının inkişafına, dünyagörüşünün genişlənməsinə və interkultural kompetensiyanın formalaşmasına töhfə verir. Ədəbi mətnlər dilin funksional və emosional imkanlarını daha geniş şəkildə təqdim edir, tələbələrin analitik və tənqidi düşünmə bacarıqlarını inkişaf etdirir, eyni zamanda onların dil öyrənməyə olan marağını və motivasiyasını artırır (Duff, Maley, 1990).

Bu məqalədə ədəbi mətnlərin alman dili dərslərində istifadəsinin əhəmiyyəti, didaktik və metodoloji üstünlükləri, eləcə də tədris prosesində tətbiq edilə biləcək müxtəlif yanaşmalar araşdırılır. Məqsəd, ədəbi materialların xarici dil öyrənməsin necə töhfə verdiyini və bu materialların müasir pedaqoji metodlarla necə uyğunlaşdırıldığını nəzərdən keçirməkdir.

**Tədqiqat**

Son illərdə xarici dil dərslərində xüsusəndə alman dilində orijinal mətnlərin əsas komponenti və mənbəyi kimi kurrikulumda ədəbi mətinlərin və bədii ədəbiyyatın rolu yenidən diqqəti cəlb etmişdir. Xarici dillərin tədrisində bədii ədəbiyyatdan istifadə bir sıra səbəblərə görə intibah dövrünü yaşayır. Tədris prosesinin öyrənilən dilin funksional istifadəsinə yönəldiyi ədəbi materiallardan istifadə etməklə xarici dilin tədrisinə bəzi ənənəvi yanaşmalar daha az populyarlaşıb. Bununla belə, xarici dillərin tədrisinin müxtəlif üsullarında ədəbi mətnlərin rolu indi yenidən qiymətləndirilir və bir çox müəllimlər ədəbi mətnlərə geniş linqvistik və mədəni məlumat verən, tələbələrin öz fikirlərini başqa dillərdə ifadə etmək bacarıqlarının inkişafı üçün təsirli stimul kimi, eləcə də bir potensial kimi baxmağa başlayıblar (Collie, Slater, 1990).

Bu gün ədəbi material seçimi artıq Böyük Britaniya və ABŞ kimi ölkələrdəki ədəbi mənbələrdən olan mətnlərlə məhdudlaşmır, müxtəlif formalardan istifadə edən müxtəlif ölkə və mədəniyyətlərdən olan yazıçıların əsərlərini əhatə edir.

Məlumdur ki, xarici dillərin tədrisinin məzmunu tələbələri təkcə şifahi ünsiyyətin yeni üsulu ilə deyil, həm də öyrənilən dildə danışan xalqın mədəniyyəti, öyrənilən dilin ölkəsində nitq davranışının milli-mədəni xüsusiyyətləri ilə tanış etməyə yönəldilməlidir. Qalskovanında qeyd etdiyi kimi, bu prosesi düzgün həyata keçirmək digər mədəniyyətləri başa düşmək, onları xüsusiyyətləri və fərqlilikləri ilə tanış etmək və digər icmaların nümayəndələrinə qarşı tolerant münasibət bəsləməkdir (Gal'skova, 2003, s. 11-12).

Alman dilinin tədrisində əsas məqsəd kommunikativ bacarıqların inkişaf etdirməkdir. Ədəbi mətnlər praktiki tapşırıqların yazılması üçün zəngin linqvistik məlumat mənbəyidir və qrammatik strukturlardan istifadəni və yeni lüğətdən istifadəni təsvir edən ideal tamamlayıcı kimi şagirdlərdə bütün əsas bacarıqları – nitq, dinləmə, oxu və yazı bacarıqlarını inkişaf etdirməyə kömək edə bilər (Lytayeva, Talalakina, 2011, s. 195). Müasir tələbələr təsvir olunanların zaman və dövrlərinə, eləcə də üslub və janrlarına görə fərqlənən ədəbiyyatla qarşılaşır və insan təcrübəsinin müxtəlif aspektləri (məsələn, fəlsəfi, etik, estetik) ilə tanış olurlar. Bu mətnlərə ədəbi və elmi- populyar, klassik və müasir əsərlər daxildir.

Ədəbi əsərlərin bədii dili oxucularda emosiyalar oyatmağa kömək edir və şagirdlərin idrak qabiliyyətlərini oyadır, onları mətnin məzmununa cəlb edir. Əksər xarici və yerli tədris-metodiki komplekslərdə "Lesen" (oxuyub-anlama) bölməsi ümumi maraq doğuran geniş mətnlər təklif edir; yeni məlumatların əldə edilməsinə və cəmiyyətin ehtiyaclarının başa düşülməsinə kömək etmək; öz ölkəsinin və öyrənilən dilin ölkələrinin mədəniyyətini dərk etmək. Alman dilini tədris edən fənn müəllimi ədəbi mətnləri müstəqil seçərkən tələbələrin ehtiyaclarını, motivasiyasını, maraqlarını və dil

səviyyəsini nəzərə almalıdır. Bununla belə, nəzərə alınmalı əsas amillərdən biri təklif olunan işin tələbələrin marağına səbəb olub-olmaması və güclü, müsbət reaksiyalara səbəb olub-olmamasıdır. Maraqlı mətn özündə yeni problemli məlumatları ehtiva edən, başqa mədəniyyətin dünyasına "pəncərə" açan, onun hiss və emosiyalarına toxunan və s. bir vasitə olacaq (Gal'skova, 2003, s. 133-134). Mənalı və maraqlı mətnlərin linqvistik və ekstralinqvistik xüsusiyyətlərin təhlili bacarıqlarının inkişafına müsbət təsir göstərməsi ehtimal olunur.

Şagirdlərin real təcrübələri və duyğuları ilə əlaqəli kitabların seçimi də böyük əhəmiyyət kəsb edir. Dil mürəkkəbliyindən danışarkən, tamamilə aydındır ki, ədəbi əsərin dili sadədirsə, bu, bədii mətni başa düşməyi asanlaşdıra bilər, lakin təlim keçmiş oxucu üçün dilin "mürəkkəbliyi" oxumağa maneə olmayacaq (McRae, 1991).

Ədəbi materialı öyrənmək üçün bir neçə yanaşma var. Klassik və müasir yazıçıların əsərlərini həm orijinal formada, həm də sadələşdirilmiş və ya qısaldılmış variantda, "asan oxu" adlanan formada öyrənmək olar. Xüsusilə bu kateqoriyadan olan oxucular üçün yazılmış ingilis, alman və digər xarici dillərin tələbələri üçün getdikcə daha çox bədii əsərlər nəşr olunur. Hər iki iş üçün istifadə edilə bilən ədəbi mətn növləri sinifdə və sinifdənkənar oxumaq üçün bunlara daxildir (Hall, 1998):

1) qısa hekayələr,
2) nağıllar,
3) romanlar,
4) pyeslər

Romanlar, pyeslər və ya qısa hekayələr dünyası xəyali olsa da, bir çox sosial və ya regional qrupların personajlarının təsvir oluna biləcəyi tam və rəngarəng bir mühit təmin edir. Mətnlərə audio mətnlər, musiqi CD-ləri, film klipləri, podkastlar əlavə oluna bilər ki, bu da materialın hissiyyatla qavranılmasına müsbət təsir göstərəcək. Bədii mətnləri oxumaq motivasiya mənbəyi kimi xidmət edə bilən yazılı nitqlə ayrılmaz şəkildə bağlıdır. Yazılı dildən istifadə tələbələrə linqvistik və üslub xüsusiyyətlərinə (savadlıq, ifadəlilik və s.) daha dərindən diqqət yetirmək imkanı verir, onlarda tənqidi düşünmə bacarıqlarını, təhlil etmək bacarığını, müstəqilliyi inkişaf etdirməyə imkan verir ki, bu da istər-istəməz ümumi akademikin inkişafına kömək edəcəkdir (Lazar, 1993, p. 195).

Didaktik nöqteyi-nəzərdən uyğun ədəbi mətnlərin seçilməsi xarici dilin tədrisində, xüsusən də alman dilinin xarici dil kimi tədrisi sahəsində mühüm rol oynayır. Mətnlər təkcə tələbələrin dil səviyyəsinə uyğun gəlməməli, həm də onların koqnitiv, emosional və mədəniyyətlərarası inkişafına təkan verməlidir. Məqsəd linqvistik, ədəbi və mədəni bacarıqları ümumi didaktik prosesdə birləşdirən inteqrativ ədəbiyyat təlimatını təmin etməkdir (Roberts, 1999).

Burada əsas metodoloji prinsip şagirdin oriyentasiyasıdır. Bədii mətnlərlə məşğul olarkən, öyrənənlər nəinki qəbuledici qalmalı, həm də yaradıcı yazı tapşırıqları, səhnə təsvirləri, rolların və perspektivlərin dəyişməsi və ya mədəniyyətlərarası müqayisələr vasitəsilə dillə məhsuldar işləməlidirlər. Bu üsullar təkcə mətni başa düşməyi deyil, həm də müasir dil tədrisinin əsasını təşkil edən kommunikativ səriştəni inkişaf etdirir (Stern, 1983).

Bundan əlavə, çox perspektivli öyrənmə ruhunda medianın inteqrasiyası (məsələn, filmlərə uyğunlaşmalar, audio kitablar, podkastlar, şəkilli hekayələr) bədii mətnlərə çıxışı asanlaşdıra və öyrənənlərin motivasiyasını artıra bilər. Ədəbiyyat və media səriştəsinin birləşməsi həm də səriştə yönümlü xarici dil tədrisi üçün mövcud tələblərə cavab verir (Tarasova, Vanyagina, 2015).

Nəhayət, mədəniyyətlərarası didaktika da mühüm rol oynayır: ədəbi mətnlər xarici düşüncə və yaşayış tərzinə dair anlayışlar təqdim edir, beləliklə, empatiya, tolerantlıq və perspektivləri dəyişmək bacarığını təşviq edir. Beləliklə, onlar mədəniyyətlərarası səriştənin inkişafına dəyərli töhfə verirlər (Widdowson, 1978).

Beləliklə, ədəbi mətnlərin alman dilində oxunmasının tədrisi tələbələrə ədəbi səriştənin inkişafı, passiv lüğətin daha yaxşı mənimsənilməsi və zənginləşdirilməsi üçün zəngin orijinal material mənbəyi açacaq; öyrənilən dilin mədəniyyəti haqqında biliklər inkişaf etdiriləcək və ümumiyyətlə, öyrənmənin əsas məqsədinə töhfə verəcəkdir.

## Nəticə

Nəticə olaraq demək olar ki, ədəbi mətnlər xarici dil tədrisində, xüsusilə də alman dili dərslərində mühüm didaktik və pedaqoji vasitə kimi çıxış edir. Onlar təkcə tələbələrin dil bacarıqlarının (dinləmə, oxuma, danışma və yazma) inkişafına deyil, eyni zamanda onların mədəniyyətlərarası anlayışlarının formalaşmasına və emosional- intellektual inkişafına da töhfə verir. Ədəbi materiallar vasitəsilə tələbələr öyrəndikləri dilin yalnız qrammatikasını deyil, həm də həmin dilin daşıyıcılarının düşüncə tərzini, mədəni dəyərlərini və sosial davranışlarını daha dərindən mənimsəyə bilirlər.

Didaktik baxımdan düzgün seçilmiş və təqdim olunmuş ədəbi mətnlər tələbələrin motivasiyasını artırmaqla yanaşı, onların yaradıcılıq qabiliyyətlərini, tənqidi və analitik düşünmə bacarıqlarını inkişaf etdirir. Eyni zamanda, bu cür mətnlər dərs prosesində müasir tədris metodları ilə (məsələn, interaktiv tapşırıqlar, audio-vizual vasitələr, diskussiya və layihə əsaslı öyrənmə) birgə istifadə olunduqda daha səmərəli nəticələr verir.

Bu səbəbdən də alman dili tədrisində ədəbi mətnlərin istifadəsi tədris prosesini zənginləşdirən, tələbələr üçün həm linqvistik, həm də mədəni baxımdan dəyərli olan bir yanaşmadır və gələcəkdə bu istiqamətdə daha çox tədqiqat və praktiki tətbiqlərə ehtiyac vardır.

## Ədəbiyyat

1. Collie, J., & Slater, S. (1990). *Literature in the language classroom: A resource book of ideas and activities*. Cambridge University Press.
2. Duff, A., & Maley, A. (1990). *Literature*. Oxford University Press.
3. Gal’skova, N. D. (2003). *Sovremennaya metodika obucheniya inostrannomu yazyku: Posobiye dlya uchitelya* (2-e izd., pererab. i dop.). ARKTI.
4. Hall, G. (1998). *Literature in language education*. Longman.
5. Lazar, G. (1993). *Literature and language teaching: A guide for teachers and trainers*. Cambridge University Press.
6. Lytayeva, M. A., & Talalakina, Ye. V. (2011). Academic skills: Sushchnost’, model’, praktika. *Voprosy obrazovaniya,* (4), 178–201.
7. McRae, J. (1991). *Literature with a small ‘l’*. Macmillan.
8. Roberts, P. (1999). *Using literature in the language classroom*. Cambridge University Press.
9. Stern, H. H. (1983). *Fundamentals of language education*. Oxford University Press.
10. Tarasova, V. V., & Daminova, E. R. (2021). Rol’ khudozhestvennoy literatury pri obuchenii inostrannym yazykam. *Kazanskiy vestnik molodykh uchenykh. Traditsii i innovatsii v metodike prepodavaniya inostrannykh yazykov*, 372.8, 63–65.
11. Tarasova, V. V., & Vanyagina, S. V. (2015). Skazka kak sredstvo razvitiya yazykovykh navykov uchashchikhsya na urokakh angliyskogo yazyka. *TerraLinguae: Sbornik nauchnykh statey*, (2), 237–240. Izdatel’stvo TAI.
12. Widdowson, H. G. (1978). *Teaching language as communication*. Oxford University Press.

Daxil oldu: 06.01.2025
Qəbul edildi: 11.04.2025

DOI: https://doi.org/10.36719/2706-6185/47/264-272

**Murad Majidzadeh**
Baku State University
Master student
https://orcid.org/0009-0003-3017-6998
mecidzade05@gmail.com

# The Impact of Digital Capabilities on Supply Chain Efficiency, Transparency and Resilience

## Abstract

Supply chain competitive execution alludes to the comprehensive qualities of a supply chain to outperform competitors within the competitive advertise by successfully allocating resources and conveying esteem to the showcase in this manner winning more openings for development. Setting up a supply chain with supported competitive execution is a crucial strategic approach for organizations to outlive and accomplish maintainable development in a energetic worldwide advertise. The term feasible competitive advantage SCA was initially introduced by Doorman who respected competitive advantage as the center of organizational performance in a competitive advertise speaking to persevering execution that surpasses competitors. Accomplishing supply chain competitive performance is the extreme objective of center undertakings in driving supply chain activities Supply chain competitiveness is characterized by its systemic nature solidness and value creation speaking to the extreme objective of transformative exercises by endeavors. Given this the ponder of how to construct feasible supply chain competitiveness has attracted research consideration. Our discoveries uncover the critical part of advanced change in upgrading supply chain capabilities which in turn emphatically impacts maintainable competitive execution. A advance investigation appears that supply chain capabilities intercede the relationship between supply chain advanced change and economical competitive execution In addition natural vulnerability can serve as a driving constrain for advanced change fortifying supply chains to upgrade their investigation of digitalization. This investigate provides valuable bits of knowledge into investigating maintainable competitive execution within the supply chain setting. It addresses the hole in experimental writing with respect to advanced change inquire about and enhances the field of possibility hypothesis.

***Keywords:*** *digital transformation, supply chain efficiency, transparency, supply chain capability*

**Murad Məcidzadə**
Bakı Dövlət Universiteti
magistrant
https://orcid.org/0009-0003-3017-6998
mecidzade05@gmail.com

# Rəqəmsal imkanların təchizat zəncirinin səmərəliliyinə, şəffaflığına və davamlılığına təsiri

## Xülasə

Təchizat zəncirinin rəqabətli icrası, resursları uğurla bölüşdürərək və bu şəkildə inkişaf üçün daha çox açılışlar qazanaraq, vitrinə hörməti çatdırmaqla rəqabətli reklam çərçivəsində rəqibləri üstələmək üçün təchizat zəncirinin hərtərəfli keyfiyyətlərinə işarə edir. Dəstəklənən rəqabətli icra ilə təchizat zəncirinin qurulması təşkilatlar üçün enerjili dünya reklamında davamlı inkişafa nail olmaq üçün mühüm strateji yanaşmadır. Mümkün rəqabət üstünlüyü "təchizat zənciri" termini əvvəlcə rəqibləri üstələyən əzmkar icradan danışan rəqabətli reklamda təşkilati performansın mərkəzi kimi rəqabət üstünlüyünə hörmət edən Doorman tərəfindən təqdim edilmişdir.

 

Təchizat zəncirinin rəqabətli performansına nail olmaq, tədarük zəncirinin fəaliyyətlərini idarə etməkdə mərkəz müəssisələrinin ifrat məqsədidir. Təchizat zəncirinin rəqabət qabiliyyəti onun sistemli xarakterinin möhkəmliyi və səylərlə transformativ məşqlərin ifrat məqsədindən danışan dəyər yaratması ilə xarakterizə olunur. Bunu nəzərə alaraq, mümkün təchizat zəncirinin rəqabətqabiliyyətliliyinin necə qurulacağına dair fikirlər tədqiqatların diqqətini cəlb etmişdir. Kəşflərimiz təchizat zənciri imkanlarının təkmilləşdirilməsində qabaqcıl dəyişikliyin kritik hissəsini aşkar edir və bu da öz növbəsində davamlı rəqabətli icraya ciddi təsir göstərir. Qabaqcıl araşdırma nəticəsində görünür ki, təchizat zəncirinin imkanları təchizat zəncirində qabaqcıl dəyişiklik və iqtisadi rəqabətli icra arasında əlaqəyə müdaxilə edir. Bundan əlavə, təbii zəiflik tədarük zəncirlərinin rəqəmsallaşma araşdırmalarını təkmilləşdirmək üçün qabaqcıl dəyişikliklər üçün təkanverici məhdudiyyət rolunu oynaya bilər. Bu təhqiqat təchizat zənciri daxilində davam etdirilə bilən rəqabətli icranın araşdırılması üçün dəyərli biliklər təqdim edir. Qabaqcıl dəyişiklik sorğusu ilə bağlı eksperimental yazıdakı boşluğa müraciət edir və ehtimal fərziyyəsi sahəsini artırır.

***Açar sözlər:*** *rəqəmsal transformasiya, təchizat zəncirinin səmərəliliyi, şəffaflıq, təchizat zənciri qabiliyyəti*

## Introduction

With the fast advancement of computerized innovations such as huge information cloud computing manufactured insights the Web of Things blockchain and 5G coupled with the interconnected worldwide economy and the tall level of instability within the outside environment dangers and openings are applying limitless impacts on the maintainable advancement and competitive execution of supply chains. For occurrence amid the COVID19 widespread the computerized economy thrived with online shopping inaccessible work online instruction telemedicine and other digitalized exercises. Companies that grasped computerized change in these regions picked up a competitive advantage whereas those that fizzled to adjust to the computerized move faced an inactive position within the showcase competition. Given the impact of computerized innovation improvement and the dubious outside environment on supply chain competitive execution creating strong and maintainable supply chains through leveraging computerized technologies has gotten to be a best need for organizations. There's an critical require for investigate and commonsense execution of computerized change in supply chains to upgrade their competitive execution at the organizational level (Al-Banna, Franzoi, Menezes, Al-Enazi, Rogers, Kelly, 2022).

Supply chain competitive execution CP alludes to compelling coordination collaboration and communication among diverse substances inside a supply chain empowering organizations to realize superior execution upgrade customer satisfaction and keep up competitiveness within the fast-paced commerce environment. With the ceaseless advancement of advanced innovations, the rationale of esteem creation in supply chains has experienced significant change in reshaping the mechanical scene and supply chain competitive elements. Clarifying the factors and components impacting supply chain competitive execution within the modern outside environment holds commonsense importance and has gathered noteworthy consideration from both the scholarly world and industry (Akbari, Hopkins, 2022).

Supply chain capability SCC alludes to an organization’s capacity to identify utilize and assimilate inside and outside resources information to encourage the exercises of the whole supply chain. Past investigation has appeared that diverse measurements of supply chain capability can affect distinctive viewpoints of supply chain execution. For illustration showcase detecting supply chain dexterity and versatility can impact the double adaptability of the supply chain. Due to the multidimensional nature of supply chain capability and the reliance of supply chain competitive execution on diverse measurements of supply chain capability totally different businesses the relationship between supply chain capability and supply chain competitive execution is complex and amniomancy.

Especially within the handle of supply chain computerized change organizations not as it were got to adjust to the turbulent outside environment but to encounter energetic changes within the inner

environment. To encourage upgrade organizational competitive execution and secure future improvement whereas keeping up their current competitive position it is essential to develop and construct supply chain capability. In this manner this consider investigates the part of four-dimensional supply chain capability within the relationship between advanced change and supply chain competitive execution from the point of view of supply chain computerized change.

**Digitization Transformation, Supply Chain Capabilities, and Supply Chain Competitive Performance**

Computerized change advances the development of a carefully empowered end-to-end supply chain extends the boundaries of supply chain administrations and encourages the arrangement of a supply chain environment which contributes to the rise of a responsive supply chain and drives the esteem extension of supply chain collaboration and integration. Subsequently it can be gathered that advanced change improves the capacity of supply chain action integration and responsiveness. Moreover advanced change upgrades the perceivability of the supply chain decreases data asymmetry among supply chain individuals and can be anticipated to fortify the data trade capability of the supply chain In conclusion sharing contracts such as benefit sharing can lead to way better supply chain execution through incentivizing collaboration between parties compared to other sorts of contracts (Baryannis, Validi, Dani, Antoniou, 2019).

**Research**

For analysing companies performance according to digitatization transformation, we have used survey method.

The survey data shows that the majority of respondents are using digital capabilities such as the Internet of Things (IoT) and Artificial Intelligence (AI) to improve their supply chain management practices. The use of these digital capabilities has led to a number of benefits, including improved supply chain performance, efficiency, and decision-making. However, there are a number of challenges associated with the use of these technologies, including high implementation costs, security concerns, a lack of qualified personnel, and data quality issues (Ghadge, Er Kara, Moradlou, Goswami, 2020).

The interview data provides a deeper understanding of the impact of digital capabilities on supply chain management. The interview data shows that the use of digital capabilities has led to significant improvements in supply chain performance, resilience, and sustainability. For example, the use of IoT devices has enabled real-time monitoring of supply chain operations, which has improved visibility and enabled faster response times to supply chain disruptions. Similarly, the use of blockchain has improved the security and trust of the supply chain by providing secure and transparent traceability of products and transactions (Baryannis, Dani, Antoniou, 2019).

Overall, the data collected in this study provides valuable insights into the use of digital capabilities and their impact on supply chain management. The results of the study can be used to inform practice and policy in the field of supply chain management and to identify strategies to improve supply chain performance, resilience and sustainability.

We used a survey method to conduct the research. We prepared 20 questions related to the application of artificial intelligence in the supply chain and gave these questions to 30 respondents. We entered the answers to these questions into SPSS and analyzed them using Anova. The questions are provided in the appendix. We will provide examples of these questions and analyze them below (Brintrup, Brintrup, Kosasih, Schaffer, Zheng, Demirel, MacCarthy, 2023).

**Research results**

**1. What digital technologies have been implemented in your organization's supply chain operations?**

1. Internet of Things (IoT) devices
2. Advanced analytics and big data platforms
3. Blockchain technology
4. Cloud-based inventory management systems

Other (specify)

**Table 1. The result of operations using**

| Descriptives | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| Mean | | | | | | | | |
| | N | Mean | Std. Deviation | Std. Error | 95% Confidence Interval for Mean | | Minimm | Maximum |
| | | | | | Lower Bound | Upper Bound | | |
| Internet of Things (IoT) devices | 4 | 2.0500 | .85732 | .42866 | .6858 | 3.4142 | 1.15 | 3.10 |
| Advanced analytics and big data platforms | 8 | 2.6063 | .40039 | .14156 | 2.2715 | 2.9410 | 2.05 | 3.30 |
| Blockchain technology | 7 | 2.5643 | .29540 | .11165 | 2.2911 | 2.8375 | 2.05 | 2.95 |
| Cloud-based inventory management systems | 6 | 2.7167 | .50365 | .20562 | 2.1881 | 3.2452 | 1.95 | 3.35 |
| Other (specify) | 5 | 2.7900 | .55610 | .24870 | 2.0995 | 3.4805 | 1.90 | 3.35 |
| Total | 30 | 2.5750 | .51924 | .09480 | 2.3811 | 2.7689 | 1.15 | 3.35 |

As we can see from the analysis results, the majority of respondents chose advanced analytics and data platforms.

| Tests of Homogeneity of Variances | | | | | |
|---|---|---|---|---|---|
| | | Levene Statistic | df1 | df2 | Sig. |
| Mean | Based on Mean | 1.978 | 4 | 25 | .129 |
| | Based on Median | 1.904 | 4 | 25 | .141 |
| | Based on Median and with adjusted df | 1.904 | 4 | 19.754 | .150 |
| | Based on trimmed mean | 1.969 | 4 | 25 | .130 |
| | | | | | |

| ANOVA | | | | | |
|---|---|---|---|---|---|
| Mean | | | | | |
| | Sum of Squares | df | Mean Square | F | Sig. |
| Between Groups | 1.463 | 4 | .366 | 1.438 | .251 |
| Within Groups | 6.356 | 25 | .254 | | |
| Total | 7.819 | 29 | | | |

As a result of the analysis, we see that the F value was 1.438. That is, since it is greater than 0.05, which technology is used does not affect the development of the supply chain. That is, choosing a

different technology can develop it. Also, since the p value is 0.251, we can say that the type of choice is more important than the choice itself (Fatorachian, Kazemi, 2021).

**How long has your organization been using digital technologies in supply chain management?**

1. Less than 1 year
2. 1-2 years
3. 2-5 years
4. More than 5 years

**Table 2. The results of using digital technologies in supply chain management**

| Descriptives | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| Mean | | | | | | | | |
| | N | Mean | Std. Deviation | Std. Error | 95% Confidence Interval for Mean | | Minimum | Maximum |
| | | | | | Lower Bound | Upper Bound | | |
| Less than 1 year | 7 | 2.2714 | .47334 | .17890 | 1.8337 | 2.7092 | 1.60 | 2.95 |
| 1-2 years | 9 | 2.4611 | .61175 | .20392 | 1.9909 | 2.9313 | 1.15 | 3.35 |
| 2-5 years | 7 | 2.7500 | .27080 | .10235 | 2.4996 | 3.0004 | 2.35 | 3.10 |
| More than 5 years | 7 | 2.8500 | .50580 | .19117 | 2.3822 | 3.3178 | 2.05 | 3.35 |
| Total | 30 | 2.5750 | .51924 | .09480 | 2.3811 | 2.7689 | 1.15 | 3.35 |

When we look at the use of artificial intelligence in the supply chain, we see that many companies have been implementing this method for 1-2 years. Considering the recent pace of development of artificial intelligence, this situation can be considered quite normal (Kamble, Gunasekaran, Parekh, Mani, Belhadi, Sharma, 2022).

| Tests of Homogeneity of Variances | | | | | |
|---|---|---|---|---|---|
| | | Levene Statistic | df1 | df2 | Sig. |
| Mean | Based on Mean | .848 | 3 | 26 | .480 |
| | Based on Median | .579 | 3 | 26 | .634 |
| | Based on Median and with adjusted df | .579 | 3 | 19.167 | .636 |
| | Based on trimmed mean | .818 | 3 | 26 | .496 |

| ANOVA | | | | | |
|---|---|---|---|---|---|
| Mean | | | | | |
| | Sum of Squares | df | Mean Square | F | Sig. |
| Between Groups | 1.506 | 3 | .502 | 0.047 | .029 |
| Within Groups | 6.313 | 26 | .243 | | |
| Total | 7.819 | 29 | | | |

Based on the Anova analysis of the duration of application of artificial intelligence, we can say that as the application period increases, the profit obtained also increases. The F value of 0.047 (<0.05) proves this. Also, the P value of 0.029 confirms our hypothesis.

**What benefits has your organization gained after implementing digital technologies in the supply chain?**

